Məsləhətçi:
*professor* **Azər Kərimov**

Toplayıb tərtib edəni və redaktoru:
**Araz Yaquboğlu**
*"Qızıl qələm" mükafatı laureatı*

**ÖMRÜN ŞƏHİDLİK ZİRVƏSİ.**
**Bakı, "Elm və təhsil", 2012. – 160 səh. + 16 səh. şəkil**

Kitab Qarabağ müharibəsində şəhid olmuş Kərimov Yasif Fəzi oğlunun əziz xatirəsinə həsr olunmuşdur. Kitabda şəhidin babası, Rəsullular nəslinin igid el qəhrəmanı, sərkərdə Məşədi Qasımın XX əsrin əvvəllərində ermənilərə qarşı mübarizədə göstərdiyi qəhrəmanlıqlar, II Dünya Müharibəsində Rəsullular nəslindən həlak olan və itkin düşənlər haqqında da geniş məlumatlar verilmişdir. Əsgər sülaləsi olan Məşədi Qasımın iki nəticəsi – Abbas Qasımov, Nəbi Zeynalov, bu kökdən olan şəhidlər – Ziyafət Balıyev, Mehdi Məhərrəmov və Rəsul İlyasov haqqında da kitabda məlumatlar öz əksini tapmışdır.

Bərdə rayonu Yeni Daşkənd kənd tam orta məktəbi hazırda şəhid Yasif Kərimovun adını daşıyır. 2012-ci ildə məktəbin girişində şəhidin büstü qoyulmuşdur.

$\frac{4702000000}{N-098-2012}$ **qrifli nəşr**

## VƏTƏNİN ŞƏHİD OĞULLARI...
### *(Atamla söhbət)*

***Torpaq, əgər uğrunda ölən varsa, Vatandır!***
**Mithat Camal Kuntay**

Əziz ata, kədərlənmə! Oğlun Yasifin şəhid olması, əbədiyyətə qovuşması üzməsin səni. Kimdir dünyanı tutub duran? Kimdir dünyada əbədi qalan? İndiki dirilərmi? Ölüm labüddür...

Din uğrunda, Vətən, azadlıq uğrunda ölüm cismani deyil, Şəhidlikdir! Behiştlikdir!

Biz İlahinin insana bəxş etdiyi ən yaxşı töhvələrlə, daima gözlənilməz yaxşı, pis, bəzən də dəhşətli hadisələrlə qarşılaşırıq.

Vətən darda olanda onun qeyrətli, namuslu oğulları ondan ötrü can verməyə, onun sipəri olmağa hazır olmamalıdırlarmı? Sən bizə baxıb «Düşmən toxmağısınız! Qadanız alım» demirdinmi? Məgər Sən özün bizi torpağa bağlılıq, Vətənə sədaqət ruhunda böyütməmisənmi?

Yaralı yoldaşları deyirlər ki, sənin qeyrətli oğlun ölümü ayaq üstə, əlində silah qarşıladı. Şəhid oldu. Elə bil torpaq üçün yaranmışdı. Bəlkə də qismət, məsləhət belə imiş. Qoy ölüm sevinməsin! Bu dəfə bizlərdən qismətinə şəhidlik düşən oğlun Yasif ölümə qələbə çaldı! Ölmədi. Ölməzlik qazandı, – indi Bərdə rayonu Yeni Daşkənd kənd məktəbi onun adını daşıyır.

Bu mənalı ölüm səssiz-küysüz ölənlərlə adiləşə bilməz. Şəhidlik yüzlərdən, minlərdən, milyonlardan birinə qismət olur. Bu şərəfli, uğurlu ölüm Ağdərədə şəhid olan

nəvən Abbas Qasımova da qismət oldu… Türk şairi Mithat Camal Kuntay necə də gözəl demişdir:

Bayraqları bayraq yapan üstündəki qandır,
Torpaq, əgər uğrunda ölən varsa Vatandır!

Dəfndən sonra müvəqqəti ayrılmağımız məni çox təsirləndirdi. Qəhər məni boğur, udquna bilmirdim. Gözlərin dolmuşdu. Ağırdır övlad üçün bu. Kimsəyə qismət olmasın. “Hamınız çıxıb gedirsiniz, qayıtmaq vaxtıdır! Sərhədlərimizi, səngərlərimizi boş qoymayın. Yiyəsiz yurdda düşmən gözü olar” – dedin. Bu sözlərdən ürəyimdən bir sızıltı keçdi. Düşünürəm, yaralanmış canımızın duyduğumuz ağrısını doğma, ögey bilmək, ona biganə olmaq olarmı? Niyə təhqir olunan torpağımızın, alçaldılan ləyaqətimizin, gözü yaşlı ana-bacılarımzın, qız-gəlinlərimizin fəryadını hamılıqla eşitmirik? Duymuruq? Məgər ümumilər ayrı-ayrı xüsusilərdən, alilər ibtidailərdən, mürəkkəblər sadələrdən ibarət deyilmi? Bu gün mənə varsa, sabah sənə var! Ümumi təhlükədə hər birimizin payı yoxdurmu? Elə o təhlükənin bir qurbanı da o biri oğlun Yüzasif oldu, SSRİ ordusuna qurban getdi.

Vətənə, torpağa namərdlik, naxələflik edən, onun alçaldılmasına biganə qalan fərarilər, ortada yeyib küncdəbucaqda gizlənənlər, qeydiyyatsız gəzənlər, qeyrət vaxtıdır!!!

İlahi, yandır əli silah tutan, tuta bilməyən övladlarının qəlbində Vətən eşqini. Bizi bu müqəddəs borca biganə etmə. Yoxsa axirət gününə qədər əzab çəkərik, gələcək nəslimiz, şəhidərimizin ruhu bizi bağışlamaz, bağışlanmarıq.

Elə bu el dərdinə şəriklik qardaşım, son beşik kiçik oğlun Vasifi Bərdə batalyonunda döyüşməyə, mübarizəni davam etməyə sövq etdi! Görürsənmi!

Mənim qəhrəman atam! Qəddini düz tut! Hələ səni belə ümidsiz, köməksiz görməmişdim. Həyatda bizə möhkəm, məğrur, əyilməz olun deyən, indi özünün möhkəmliyə, məğrurluğa ehtiyacı olan atam! Sənin ümidsizliyində bu dəfə biz – övladların möhkəmləndik, məğrurlaşdıq! Elə nəvən leytenant Hidayət Hacıyev sənə təsəlli oldu. Bərdə batalyonunda qərargah rəisinin müavinidir.

Doğrudan da, kədərin ən yüksək dərəcəsi özünün əks qütbünə çevrilib səadətə dönə bilərmiş. Həyat davam edir. Həyatımızın bu günki mənasına mübarizəmizin məqsədi kimi baxan, el qədrini öz canından daha əziz bilən, cəbhələrdə son ana qədər mərdliklə vuruşub şəhid olmağa belə hazır olan Yasif qeyrətli oğullarınla fəxr etməli, öyünməlisən. Dərd insan üçündür. Böyük Allahın verəcəyi dərd müqabilində ona uyğun səbr verməsini, həyatda hər şeyin ötüb keçdiyi kimi bunun da ötüb keçəcəyini, ancaq sonsuz dünyada unudulmayan, torpaq uğrunda, vətən yolunda şəhid olan, onun keşiyində həmişəlik qalıb sərhəd daşına dönən oğullar əbədi yaşayırlar – deyirdin. Qoy bu, bizim hamımızın təsəllimiz olsun.

Allah bütün şəhidlərimizə rəhmət eləsin!

**Azər Kərimov,**
***Azərbaycan İnşaat Mühəndisləri Universitetinin dosenti,***
***Azərbaycan SSR komsomol mükafatı laureatı***
***“Azərbaycan” qəzeti, 15 oktyabr 1992-ci il.***

## ŞƏHİD OLMAQ İSTƏYİRƏM, AY ANA!

***Bayraqları bayraq yapan üstündəki qandır,***
***Torpaq, əgər uğrunda ölən varsa Vatandır.***

**Mithat Camal Kuntay**

Bir ömür yaşadı, körpə fidan kimi yaşıllaşdı, çiçəkləndi. Ancaq elə bil ki, təbiətin qanunlarına üsyan etdi, nə saraldı, nə də soldu. Üstündən şaxtalı-sazaqlı illər ötsə də elə həmişəlik yaddaşlarda çiçəkli fidan kimi qaldı.

Ömürlərinin bahar çağında bir qarış vətən torpağı uğrunda canlarını qurban verən vətən oğulları yurdumuzun hər yerini əbədi laləzara çevirmiş gənc fidanlardır. Məzarları ilə uyuduqları məkanı sanki müqəddəs ziyarətgaha çevirmiş bu qəhrəman eloğullarımızın narahat ruhları hər an, hər dəqiqə vətən göylərindən bizləri müşayiət edir, canlarını qurban verdikləri amal, əqidə uğrunda mübarizəni ruhları ilə davam etdirirlər. Uca yaradandan və peyğəmbərlərimizdən sonra ən uca varlıq hesab edilən şəhidlərimiz zaman-zaman Azərbaycanımızı yadellilərin təcavüzkar basqınlarından qəhrəmanlıqla qoruyaraq tarixin şanlı səhifələrini öz qanları ilə yazmış və şirin canları ilə təsdiqləyərək tarixin qızıl fonduna düşmüşlər. Bu əbədiyaşar qəhrəmanlar içərisində mənim qardaşım 19 yaşlı Yasif Kərimov da vardır. Aradan az qala 20 ilə yaxın bir vaxt keçməsinə baxmayaraq Yasif mənim həmişə 19 yaşlı qardaşım olaraq qalır, illər öncə Yasif məni özünə böyük bacı kimi güvəndiyi, (dərslərində kömək edən, əlindən tutub məktəbə aparan, hər an ona dəyərli göstərişlər verən**)** məsləhətləşdiyi halda, bu gün mən həyatda atacağım hər bir addımı, ilk öncə ucaların ən ucası saydığım şəhid qardaşım Yasifin müqəddəs ruhu ilə məsləhətləşirəm. Bütün planlarım haqqında ona hesabat verməyi özümə ən müqəddəs borc bilirəm.

Baharın gəlişini ilk xəbər verən baharın elçisi qaranquşlar kimi gəlmişdi ömrümüzə Yasif. Gəlişi ilə yurdumuza sevinc-şadlıq, ruzi-bərəkət gətirən baharın ilk ayında dünyaya göz açmışdı. Təkcə bir ailənin deyil, bütövlükdə bir elin-obanın sevincinə səbəb olmuşdu. Lap kiçik yaşlarından yaşıdlarından ağılı, kamalı, yanımcıllığı, zəhmətkeşliyi və vətənpərvərliyi ilə seçilərdi Yasif.

Sanki onun balaca ürəyində igid el atası sayılan Məşədi Qasım babamın və atam Fəzi Kərimovun ürəyinin təpəri, qədd-qamətində ata-babamızın mərdliyi, məğrurluğu var idi. O, balaca ürəyində o qədər böyük sevgilər yaşadırdı ki, heç kimin ürəyində ata-anaya belə oğul sevgisi, bacıqardaşa belə qardaş sevgisi, elə-obaya, vətənə belə vətəndaş sevgisi ola bilməzdi. Üz-gözündən nur yağardı. Böyükkiçiyin yerini bilər, atdığı hər addımı ilə ailəyə başucalığı sevinc gətirərdi. Özündən iki yaş kiçik olan Vasif üçün ideal qardaş, mübariz sirdaş obrazı idi Yasif. Anamız haqqında elə möhtəşəm planları vardı ki, böyüyəndə ananın bütün arzularını yerinə yetirmək, ona ən yaxşı həyat yaşatmaq, keçmişdəki sıxıntılarını unutdurmaq, qəlbindəki Yüzasif yarasını sağaltmaq, hər an, hər dəqiqə ona qayğı göstərmək. Bu idi Yasifin ən ümdə arzusu. Sevdiyi qıza da ilk sözü "Anamı doğma ana kimi sevsən, səni baş tacı kimi sevəcəyəm" cümləsi olmuşdur.

Ürəyinə görə bir qız sevmişdi Yasif. Allah-Təala bu müqəddəs üçlüyə (Yasif, nişanlısı və anası) elə bir sevgi bəxş etmişdi ki... Kiçicik bir anı, bir dəqiqəsi, bir ömrə bərabər olan bir sevgi. Qısa zaman kəsiyində bu üçlük müqəddəs bir sevgi, məhəbbət məbədinə çevrildi. Sanki ömrünün qısa olacağını bilir, bir ömür payına düşəcək sevgisini bu qısaca ömrünə son dərəcə səxavətlə paylamağa çalışırdı.

Hərbi xidmətini başa vurduqdan sonra toy etmək, ananın gözlərindəki kədəri bir dəfəlik silmək istəyirdi. Yağı düşmənlə qızğın döyüşlərin getdiyi vaxtlarda o, döyüşə getdiyini ata-anasından ciddi-cəhdlə gizlədirdi ki, nigaran qalmasınlar. Atam Böyük Vətən Müharibəsində 4 il igidliklə vuruşmuş bir veteran kimi hər zaman əsgərlərimizlə, kəndimizin gəncləri ilə görüşür, maraqlı söhbətlər aparır, dəyərli məsləhətlər verirdi. Belə söhbətlərin birində atam Yasifə dedi ki, oğlum, şər deməsən xeyir gəlməz, düşmən əlinə düşüb eləsən kimin nəslindən olduğunu bildirmə.

Yasif yaşından qat-qat böyüklərə xas olan tərzdə cavab verdi.

– Ata başqasının adı altında gizlənməkdənsə, elə babam Məşədi Qasımın adına layiq nəvə kimi ölərəm.

Qısa ömür yolunda şanlı bir döyüş yolu keçdi Yasif. Döyüş bölgələrində nisbi sakitlik yarananda əmioğluları Ziyafət, Mehdi və Rəsulla, dostları Qulam, Cəfər, Rəşadət, Elçin, Firudin, Eldəniz, Məhərrəm və Ziya ilə görüşüb məsləhətləşir, bir-birilərinə döyüş taktikalarını öyrədir, özlərini qorumağı söyləsələr də, əslində hər biri bu yolda ölməyə hazır olduğunu gizlətmirdilər. Məzuniyyəti vaxtı Bakıya gəlmişdi. Şəhidlər xiyabanına getdik. Xocalı şəhidlərinin qəbrindən ayrıla bilmirdi. Hər şəhid məzarı qarşısında uzun müddət dayanır, acı göz yaşlarını ürəyinə axıdaraq sanki bu şəhidlərin ruhu qarşısında and içirdi. Geri dönərkən dediyi bir cümlə elə oradaca ürəyimə bir od saldı.

– Bacı, adam bu şəhidləri burda qoyub evə getmək istəmir, elə burada onlarla qalmaq istəyir, – dedi, – Yasif.

Elə həmin gündən etibarən mənim kiçik ürəkli qəhrəmanım sanki həyatının ən mühüm qərarını qəbul etmişdi.

– Nə qədər ki, vətən dardadır bizə rahatlıq yoxdur, bu şəhidlərimizin qanını yerdə qoymayacağam.

Son nəfəsinədək də əhdinə sadiq oldu mənim şir ürəkli qəhrəmanım. Özü ilə kəndimizin bütün cavanlarını da mübarizəyə ruhlandırdı. Qızğın müharibə illərində övladlarını müharibədən yayındıran soydaşlarımızı görəndə deyirdi ki, zaman hər kəsə öz layiqli qiymətini verəcək. O illər ərzində, bəlkə də respublikamızda yeganə kənd idi bizim kəndimiz. Belə ki, qocasından cavanına, gəlinindən qızına kimi silaha sarılaraq müsəlləh bir ordu kimi döyüşə hazır vəziyyət almışdı. Düşmənlə döyüşə girən hər bir gəncimiz arxasında belə bir mütəşəkkil ordunun olduğuna güvənir və daha da əzmkarlıqla döyüşürdülər.

Elə kəndimizin ilk şəhidi də mənim Yasif qardaşım oldu. Yasifin məzarı başında and içən əmisi oğlanları Ziyafət, Mehdi və Rəsul, dostları Qulam, Cəfər, Rəşadət, Elçin, Firudin, Eldəniz, Məhərrəm və Ziya son nəfəslərinədək igidliklə döyüşərək zamanın daşa dönmüş sinəsinə silsilə qəhrəmanlıq səlnaməsi yazdılar, şəhid oldular. Çiçəyin ətri burnunda olan gözlərindən sevgi, məhəbbət yağan, üzlərindən nur tökülən bu el oğullarının hər biri bizim and yerimizə, son anda üz tutacağımız müqəddəs məbədgahımıza çevrildilər. Qəbriniz nurla dolsun, atanızın çörəyi, ananızın südü sizə halal olsun! Bir də mənim əziz qardaşlarım, sizə uğrunda canınızı, qanınızı əsirgəmədiyiniz torpaqlarımızın azadlığını, Azərbaycanımızın bütövlüyünü qazanmasını arzulayıram. Mən əminəm ki, o zaman sizin vətən göylərində narahatlıqla dalğalanan ruhunuz rahatlıq tapacaq.

**Sənubər Fəziqızı,**
***"Press-Media" qəzeti, №13(137). 26 fevral 2010-cu il.***

# TALEYİNƏ ŞƏHİDLİK QİSMƏT OLAN QARDAŞIM

Kəndimiz – İrəvan xanlığı Göyçə mahalının Daşkənd kəndi. Hal-hazırda Bərdə rayonunun Yeni Daşkənd kəndi. 1948-53-cü illərdə millətçi daşnak erməni təqibinə məruz qalan guya könüllü, əslində isə min bir məhrumiyyətlə məcburən köçən, köçürülən kənd. Qaçqın kənd, didərgin kənd.

Qəhərdən boğulan gözləri nəmli, taleyi qəmli Böyük Vətən Müharibəsinin II qrup əlili, şəhid atası, qaçqın atam Fəzi Kərimov dinimizin, xalqımızın, torpağımızın təhqir olunmasına dözməyən, öz yurdundan didərgin düşən igid babam Məşədi Qasım Hacı Kərim oğlunun Göyçənin mərd oğulları ilə birlikdə əvvəllər Göyçə mahalı, sonralar Qarabağ, Malıbəyli, Xocalı uğrunda gedən döyüşlərdə mənfur yağı düşmənlərlə apardığı ölüm-dirim vuruşmasını («Vətən səsi», №11(47), 14.03.1991; Z.Bünyadov, «Xəbərlər» №4 səh.87,91. 1989) o vaxtki hadisələri xatırlayır, həsrət qaldığı doğma, ata-baba yurdunun xırdaca daşının, ağacının belə gözləri önündən getmədiyini, bir an belə unutmadığını, «bir də o yerləri görəydim, sonra öləydim», – deyirdi, bizi də kövrəldirdi. O vaxtdan çox keçsə də, düşmənlərə qalan torpaqlarımızın, müqəddəs ata-baba yurdlarımızın qaytarılması, haqq-ədalətin bərpa olunması işi bir an belə yadımızdan çıxmamış, tarixin bu haqsızlığının gec-tez düzəlməsinə ümidimizi itirməmişik.

Məgər torpaqlarımıza bilə-bilə olunan qəsd, sərhədlərimizin pozulması, müqəddəs əcdadlarımızın ruhlarının dolaşdığı məmləkətimizin yağı düşmən tapdağı olması belə qovulmaların nəticəsi olmamışdırmı? Qaçqın olmuşuq, susmuşuq. Bizi kütləvi qıran, diri-diri yandıran, «türklər bizim

düşmənimizdir» deyə bağıran, təzə gözü açılan dığaları bu ruhda tərbiyə edən, qətlimizə məqam axtaran, bu işdə hər nəyi varsa qurban verməyə hazır olan şirin dilli, əfi ilan zəhərli din düşmənlərimizi hələ bağışlamışıq da. Nə üçün vaxtilə ata-babalarımız övladlarının adlarına «qaçqın», «didərgin» ləqəbi qoymayıblar? Bu haqsızlığı aləmə car çəkməyiblər? Yoxsa sonrakı müsibətlər xalqımızın başına gələrdimi? Məruz qaldığımız soyqırıma layiqli siyasi və hüquqi qiymətin verilməməsində özümüz günahkar deyilikmi? İndi də tarixin bu haqsızlığı təkrarlanır. Vaxtilə qradlardan, kristallardan Tərtər rayonuna atılan mərmilərin səsindən evlərinin şüşələri sınan, vahimələnən kənd camaatı, cəsarətli balalarımız, Vətən torpağının hər qarışı uğrunda ölüm-dirim mübarizəsinə atılan hər döyüş kəndi basılmaz bir qaladır düşünən ürəklərdən, qəlblərdən bir sızıltı keçir. Bəs nə vaxt haqq-ədaləti ortaya çıxararaq buna son qoyacağıq?

Bu cavabsız suallar mənə Ağdərə, Drambon döyüşlərində şəhid olan rəhmətlik qardaşım Yasiflə kəndimizə gedən yolda, ölümündən bir həftə əvvəl görüşdüyümüz son görüş gününü xatırladır.

Amansız yaddaşıma həkk olunan, heç bir yağışın yumadığı, şimşəyin, tufanın qoparmadığı o gün yaxşı yadımdadır. Mən Bakıdan evə – kəndə, o isə hərbi formada rayona – batalyona növbəyə gedirdi. Maşından düşüb öpüşüb görüşdük. Gözlərimə inanmadım, dünənə qədər uşaq bildiyim qardaşım necə böyüyüb məğrurlaşmışdı. Üzündən-gözündən nur tökülür, hərbi forma onun cəngavər görkəmini bir az da cazibədar edirdi. «Özünü gözlə, hələ tezdir sənə ağır döyüşlərə getmək… Hər şey ola bilər», – dedim. Etiraz kimi ancaq hörmət əlaməti olaraq üzünü yana tutub, «Evdə də bunu mənə deyirlər. Bəs kim getsin döyüşə? Yaxına düşən düşmən mərmilərinin səsindən kənddə, evdə

durmaq olmur. Hara qaçaq? İnsan öz torpağından neçə dəfə qaçqın düşər? Geriyə yol yoxdur!» Ruhu şad olsun bütün şəhidlərin. Onun cavabsız qalan sualları indi də fikrimdə səslənməkdədir.

İki qardaşın kənd yolunda dialoqu. Halallaşdıq. Şər qarışırdı. Ayrılanda bir şəkil verdi mənə. «Xatirə saxla» dedi və ayrıldıq. Mən evə doğmalarla görüşə, o isə Vətənin keşiyində əbədi qalmağa gedirdi.

Adətən bir-birimizlə evdə görüşməyi adət etdiyimizdən qürub çağı bizi ayıran bu görüşdən sonra bir üşütmə keçdi ürəyimdən, qəribə hisslərlə yoluma davam etdim. Bu mənim taleyinə şəhidlik qismət olan qardaşım Yasiflə son görüşüm idi.

Dəfn zamanı şəhidin Bakıya, Şəhidlər Xiyabanına aparılması təklifini eşidən atam onu el qəbirstanlığında uyuyan qardaşlarından ayırmayacağını dedi. Bu, şəhid qanı tökülən torpaqlarımızın unudulub sahibsizləşməsi, pusquda duran quzğun xislətli düşmənlərimizə lazımi xidmət olardı. Doğru sözə nə deyəsən? Məgər şəhid üçün Vətənin hər qarış torpağı müqəddəs deyilmi?

«Vaxt hər şeyi udur və unutdurur», – deyirlər. Həmişəlik sükuta qərq olunmuş yataq otağı, müxtəlif cəbhə şəkilləri, qəzet materialları, donmuş baxışlarda suallar!

İgid oğlanlarımızın qanı hesabına azad edilmiş kəndlərimiz, döyüş əhəmiyyətli mövqelərimiz biganəlik, hərcmərcliklə kimlərinsə iyrənc siyasi marağına görə yenidən düşmənə verilib? Bu nə deməkdir? Daxili sıxıntıdan əriyirəm, bütün varlığımla sarsılıram.

Ağır itki valideynlərin, doğmaların baxışlarında özünü biruzə verir. Sanki qarşılaşmaqdan ehtiyat edirlər. Nə ilə, hansı təsəlli ilə unutdurmaq, hansı məlhəm ilə ovundurmaq olar parçalanmış, buzlaşmış ana ürəyini?

Bir nəğmə oxuyur,
Bülbül ömrü uzunu.
Nə haqdadır, o nəğmə,
Bir kimsə bilmir bunu!
Vətən nəğməsidir,
Sevgi nəğməsidir,
Dinlə bunu, ey könül.
Olsaydı qeyri nəğmə,
Çoxdan bezərdi bulbul!

Vətənimiz, anamız torpaq üçün yaranmamışıqmı? Vətən darda olanda, yağı gülləsi qabağına çıxmaq, ölməzlik qazanmaq, əbədiyyətə qovuşmaq, şəhid olmaq, ona olan tükənməz məhəbbətin son zirvəsi deyilmi?

Az keçmədi kənd camaatı daha bir sarsıdıcı xəbər aldı. Qısa ömür kitabını qəhrəmanlıq salnaməsi ilə tamamlayan elimizin qeyrətli, qorxmaz oğlu milis baş serjantı Ziyafət Balıyev Ağdərə döyüş mövqeyindən hərbi sursatla dolu avtobusu çıxararkən şəhid olmuşdur. Sən bir taleyin hökmünə bax, sağlığında qoşa gəzən igid əmioğlulara el qəbirstanlığında birgə uyumaq, torpaqlarımızın keşiyində əbədi qalmaq qismət oldu.

Şimşək ömürlü şəhidlər, Allah sizə rəhmət eləsin!

Ruhunuz şad olsun!

Siz şəhidsiz,
Vətən Sizsiz!
Torpaq üçün
Ölən sizsiz!

**Azər Fəzi**
***Çexiya-Azərbaycan Elm Mədəniyyət Mərkəzinin sədri,***
***Çex Respublikası Ali Texniki Universitetinin professoru***
***“Vətən səsi” qəzeti, 7 may 1993-cü il***

## ÖMRÜN ZİRVƏSİ ŞƏHİDLİKDİR

***Bir ana fəryadı səsləyər Səni!***

Göyçə mahalından, doğma ata-baba yurdundan didərgin düşmüş, igid babamız Məşədi Qasım Hacı Kərim oğlunun, əvvəllər Göyçə mahalı, sonralar Xocalı-Əsgəran, öz adı ilə adlanan Qasımlı kəndi uğrunda gedən döyüşlərdə yağı erməni düşmənlərlə vuruşmasını eşidə-eşidə böyümüşdü. O, elə bil qisas almaq üçün fürsət gözləyirdi. Həyat eşqi ilə yanan, parlaq, gülən gözləri nələr vəd etmirdi, nələr söyləmirdi!!!

Vaxt gəldi çatdı. Bərdə rayonu Yeni Daşkənd kəndində boya-başa çatan Yasif Fəzi oğlu Kərimov Bərdə batalyonunda hərbi xidmətə başladı. Qeyrəti, işgüzarlığı, istiqanlığı ilə az müddətdə birinci bölüyün rəğbətini qazanmışdı. Xoş arzuları tükənməz idi!!! Nişanlı olduğunu əsgər yoldaşlarına sözarası demişdi. Gözlərindən «Sənsiz keçən günlərim» intizarı oxunurdu. Qələbənin yaxınlığına heç bir şəkk-şübhəsi yox idi.

Fəqət, 22 avqust 1992-ci ildə Ağdərə rayonu Drambon ətrafı uğrunda gedən döyüşlərdə düşmən qəlpələri həmişəlik söndürdü sayrışan sonsuz bir ümidin qığılcımlarını:

Ölüm necə qıydı cavan canına.
Torpaq şəhidini aldı qoynuna.
Ahımız, naləmiz uçar yanına.
Bir ana fəryadı səsləyər Səni!
Qoruya bilmədik ölümdən Səni!

Öz şəhidliyi ilə ölməzliyi qazandı, qəlblərə, ürəklərə köçdü, əbədiləşdi. Xalqımızın azadlıq rəmzi olan xalının ilmələrini al qırmızı qanı ilə bəzədi, rənglər ümmanına qa-

rışdı, Mənim, Sənin, Bizim hamımızın, Vətənimizin sipər daşı oldu.

Vətən! Daşına, torpağına qurban olum. Sənin uğrunda ölərəmsə, onda Vətənsən, Vətənimsən deyən həmin batalyonda döyüşən kiçik qardaşı Vasif Kərimov xalqımızın azadlığı, müstəqilliyi, torpaqlarımızın bütövlüyü uğrunda döyüşü davam etdirməyi, şəhid qardaşlarımızın qanını yerdə qoymayacağını bildirir, hamını bu müqəddəs borcu dərk etməyə çağırır.

Doğrudan da, ot kökü üstə bitərmiş! Başı qarlı, dağ vüqarlı el ağsaqqalı, Böyük Vətən Müharibəsinin ikinci qrup əlili, dörd oğul itirmiş şəhid atası, babam Fəzi Kərimov bu müharibədə vuruşanların və şəhid olanların hamısı mənim balam, övladlarımdır! İndi o tək bizim deyil, hamınındır, - deyə təsəlli verir, şəhidin döyüş (cəbhə) yoldaşlarına uğurlar diləyirdi.

Bu ağsaqqal xeyir-duası mənə tanış idi. Onu babam bu ilin yazında Xanlar batalyonunda döyüşən, Goranboyun Mənəş, Buzluq, Erkəc, Başkənd, Başqışlaq kəndlərinin, Gülüstanın alınmasında, Ağdərənin Talış, Qırmızı kənd, Maqadis kəndlərində və rayon mərkəzinədək gedən döyüşlərdə qəhrəmanlıqla vuruşaraq şəhid olan - snayperçi nəvəsi Abbas Talıb oğlu Qasımovun ölüm xəbərini eşidəndə də demişdi:

Vətən torpağı qu tükü olsun,
Ana südü halal olsun Sizə.
Şəhid oğul, şəhid nəvə!

Əhsən sənə qəhrəman ata, qəhrəman baba!
Allah rəhmət eləsin!

**Hidayət Hacıyev,**
***Bərdə batalyonu qərargah rəisinin müavini, leytenant***
***«Ədalət» qəzeti, 8 sentyabr 1992-ci il.***

## LAÇIN VÜQARLI YASİF

Doğulduğum kəndin qəbirstanlığında ilk şəhid məzarı 10 il bir sinifdə bərabər oxuduğum Yasifin məzarıdır. Yasiflə mən sinif yoldaşlığından əlavə bir soydan – Rəsullular nəslindənik. O, sinifimizdə oxuyan oğlanların ən hündürü, ən canlısı, ən tez bığ yeri tərləyəni idi. Bəzən məktəbimizə gələn yoxlamalar onun yaşı ilə maraqlanar, elə başa düşərdilər ki, o bizdən bir-neçə yaş böyükdür. Bəli, Yasif belə bir laçın oğlan idi.

Biz 1990-cı ildə orta məktəbi bitirdik. Yasif 18 yaşında, yəni 1991-ci ildə sevdiyi qızla nişanlanmışdı. Zahirən çox xoşbəxt görünürdü. Yaxşı yadımdadır. Mən tələbə idim. Təzəcə Azərbaycan İnşaat Mühəndisləri İnstitutuna (indiki Azərbaycan Memarlıq və İnşaat Universiteti) daxil olmuşdum. Yataqxana məsələsi həll olunmadığından müəyyən müddət Yasifin qardaşı, həmin institutda dosent işləyən Azər müəllimin evində qalırdım. Həmin ərəfədə Yasif və atası, el-obamızın ağsaqqalı Fəzi Kərimov Bakıya, Azər müəllimgilə gəlmişdilər. Onu da deyim ki, Yasifin idarə etdiyi "Zaporojets" maşını atasına Böyük Vətən Müharibəsi veteranı olduğu üçün verilmişdi. Yasiflə Bakıdakı bir neçə günlük görüşümüz zamanı onun istədiyi qıza necə vurulmağından, onu necə sevdiyindən, necə nişanlanmağından ürək dolusu danışdı. Arzuları saysız-hesabsız idi. El misalında deyildiyi kimi "Sən saydığını say, gör fələk nə sayır". Heç nişanlanmasından bir il keçməmiş Yasif yenicə yaranmaqda olan Milli Orduya yazıldı. Vətənimizin üzərində dolanan qara buludlar onu da rahat buraxmadı. Təəssüflər olsun ki, Qarabağ münaqişəsi get-gedə gərginləşməkdə idi. Bu gərginlik sonucda respublikamızı Qarabağ müharibəsi kimi bir müharibəyə cəlb etdi. Gənclərimiz hərbi xid-

mətə başlar-başlamaz bir başa qaynar nöqtələrə göndərildilər. Yasif nişanlı olduğu üçün əsgər yoldaşları onu qanlı döyüşlərə girməyi məsləhət bilmir, hətta qoymurdular. Ancaq Yasif bununla barışmır, özündə rahatlıq tapa bilmir və inadkarlıqla döyüşlərdə iştirak edirdi.

Qarabağ müharibəsinin ən ağır ili, ən ağır ayı idi. Yasifin son döyüş günü… 22 avqust 1992-ci il... Bərdədə yerləşən 18136-cı hərbi hissənin avtomatçısı olan Yasif Kərimov Ağdərə rayonunun Drambon kəndi (indiki Kəlbəcər rayonunun Heyvalı kəndi) uğurunda gedən döyüşdə qəhrəmancasına həlak oldu. Tanınmış yazıçımız Nahid Hacızadə demişkən "...torpağı Vətənə çevirən, onun adını al qanı ilə günəşli üfüqlərə yazan onun övladlarıdır." Bəli, Yasif də al qanı ilə Vətənin adını torpaq üzərində yazdı. Və beləcə şəhidlik zirvəsinə ucaldı. Hərdən Yasifi xatırlayanda yaddaşımda iz qoyan atası Fəzi kişinin sözləri məni duyğulandırır. Yasifin yas mərasimində bizim də əyləşdiyimiz stolda heç kim qoyulan ehsana əl uzatmırdı. Həyatda buna qədər üç dəfə oğul itkisi görən ağsaqqal Fəzi baba stola yaxınlaşıb dedi: – "Ay balalarım, ay camaat. Yasifin toyu üçün bəslədiyim heyvan onun ehsanına qismət oldu. Bişirilən ehsanı yeməmək günah sayılır, neyləmək olar qismət beləymiş. Hamı bismillah eləsin, çörək kəssin."

...Kənd camaatının təklifi və tələbi ilə Yasif Kərimovun təhsil aldığı Yeni Daşkənd kənd orta məktəbinə onun adı verilmişdir. Məktəbdə "Şəhidlər guşəsi" yaradılmışdır. Hər il şəhid Yasif Kərimovun ad günü məktəbdə geniş şəkildə qeyd edilir. Növbəti dərs ilində məktəbin girişində şəhid Yasif Kərimovun büstünün qoyulması nəzərdə tutulub. Yasif artıq bir evin yox, bir elin övladıdır. Onun xatirəsi onu tanıyanların və kənd əhalisinin qəlbində yaşayır.

Allah sənin timsalında bütün şəhidlərimizə rəhmət eləsin, Yasif! Sən ölmədin, sən ölümünlə ölməzliyi qazandın. Sənin məzarın səni tanıyanların hamısının ziyarət yeridir. Rahat yat şəhid sinif yoldaşım. Qəbrin nurla dolsun!

**Araz Yaquboğlu,**
***"Qızıl qələm" mükafatı laureatı***
***"Dünya" qəzeti, №39-40, 2012-ci il.***

## ƏBƏDİYAŞAR QƏHRƏMAN

Yaddaşlara həkk olunan 1992-ci ilin 22 avqust günü, əziz, unudulmaz Yasiflə həmişəlik vidalaşdığımız gün... Kaş ki, o günü silə biləydik yaddaşımızdan, xatirəmizdən.

Acımız heç vaxt yaddan çıxmaz. Azərbaycanımızı həyatı qədər sevən Yasif Fəzi oğlu Kərimov azadlığımız, müstəqilliyimiz uğrunda son damla qanını belə əsirgəməyən mərd, qeyrətli, ulu Göyçənin ulu sərkərdəsi Məşədi Qasım Hacı Kərim oğlunun mənfur erməni qəsbkarlarıyla mübarizəsinin davamçısı kimi yaşadı, vuruşdu, şəhid oldu.

Doğrudanda vaxtsız ölüm sənə yaraşmır! Tufan, şimşək ömürlü Yasif! Heyif səndən! Sənin yoxluğuna inana bilmirik.

Cəbhəyə getməzdən əvvəl Bakıya tez-tez gəlirdi. Sonralar bir müddət Bakı şəhərində yaşayası oldu. O zaman bizdə qalırdı. İndiki kimi yadımdadı sözündən, söhbətindən doymaq olmurdu. Olduqca mehriban, ağıllı, təvazökar, öz yerini bilən, xeyirxah bir insan idi o! Hər söhbətində dünyanın faniliyindən, həyatın vəfasızlığından, təbiətə vurğunluğundan, onun gözəlliyindən söhbət edərdi. Sanki hiss etmişdi o, bu vaxtsız ölümü.

Hələ gənc yaşlarından vətənimizi, torpağımızı azad görmək istəyirdi. Elə bu arzu sonda onu Tərtər rayonuna cəbhə bölgəsinə odun-alovun qızğın yerinə gətirdi.

22 avqust 1992-ci il, Bərdə rayonunun Yeni Daşkənd kəndinin daşı da, torpağı da göz yaşı axıdırdı həmin gün. El əhli qohum əqraba, döyüş yoldaşları, dostları, ata, qardaş-bacı naləsi, ana fəryadı göyə qalxmışdı. Həmişə eyş-işrətli olan ata evində başqa əhvali-ruhiyyə var idi. Ürəklər sızıldayır, gizli-gizli ağlayırdıq. Vaxtsız ölüm hamını sarsıtmışdı.

Ölüm necə qıydı cavan canına.
Torpaq şəhidini aldı qoynuna.
Ahımız, naləmiz uçar yanına.
Bir ana fəryadı səsləyər Səni!
Qoruya bilmədik ölümdən Səni!

Yenə də boy-buxunlu, yaraşıqlı, gülərüzlü, xoşxasiyyətli, hamının sevimlisi kimi durmusan gözlər önündə, Yasif... Səni həmişə belə tanımış, belə görmüş, belə sevmişik. Təbəssümünə möhtacıq, yoxluğuna inana bilmirik.

Acımız heç vaxt yaddan çıxmaz, unudulmaz!

Allah sənə rəhmət eləsin, qəbrin nurla dolsun, əbədiyaşar qəhrəman! Sənin əziz xatirən səni sevənlərin qəlbində daima yaşayacaqdır.

**Namizər Kərimova,**
***Bakı şəhəri Xətai rayonu 249 saylı orta məktəbinin riyaziyyat müəllimәsi***
***22 avqust 1993-cü il***

## QORXMAZLIĞINI HAMI BİLİRDİ

1973-cü ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində anadan olub Yasif. Orta məktəbi qurtardıqdan sonra bir müddət "Göyçə" kolxozunda işləyib, sonra isə Bərdə ərazi özünümüdafiə batalyonuna üzv yazılıb. 1992-ci ildə Ağdərənin Drambon kəndi ətrafında gedən döyüşlərdə həlak olub.

Saz səsi ilə, şeir nəfəsi ilə böyümüşdü Yasif. Atasının, ulu babasının vətəni olan Göyçənin həsrəti ilə yaşayırdı. Hələ Dağlıq Qarabağda münaqişə başlamamışdan əvvəl Yasif oğuz türklərinin məskəni olan Göyçənin nə vaxtsa yenidən Azərbaycanın bir hissəsinə dönəcəyinə özünü inandırmışdı. Başqa cür də ola bilməzdi. Səhər də, günorta da, axşam da evlərində, yaşadığı Yeni Daşkənd kəndində Göyçə ilə bağlı nəsə danışılardı. Bu danışıqlar, bu söhbətlər Yasifi Göyçəyə elə bağlamışdı ki... başqa cür düşünə bilməzdi.

Dağlıq Qarabağda münaqişə başlayanda Yasif hələ yeniyetmə idi. 14-15 yaşı vardı. Amma bununla belə düşmənlə mübarizəyə atılmağa hazır idi. Qədim Göyçədən üzü bəri köç başlayanda Yasif də, Yeni Daşkənd kəndinin digər cavanları da dözə bilmirdi dədə-baba torpağının itirilməsinə. O, xəyallarında Göyçəni Azərbaycana birləşdirməyə çalışırdı. Ancaq həyat onu başqa acı hadisələrlə qarşılaşdırdı.

Əsgər yaşı çatar-çatmaz cəbhəyə yollandı. Bərdə özünümüdafiə batalyonuna yazıldı. O, milli orduya gedən vaxt Dağlıq Qarabağda, xüsusilə Ağdərə bölgəsində qanlı döyüşlər gedirdi. Ona görə da uzun-uzadı təlim-məşq keçmə-

yə vaxt yox idi. Qısa müddətli hazırlıqdan sonra Yasif Kərimov birbaşa qaynar nöqtələrə göndərildi.

***Bərdə ərazi özünümüdafiə batalyonu qərargah rəisinin müavini, leytenant Hidayət Bəhrəm oğlunun yazdıqlarından:*** – Yasif az vaxta hərbi vərdişlərə mükəmməl yiyələnməsi ilə komandirlərin, əsgər yoldaşlarının sevimlisinə çevrildi. Neçə-neçə quldur yuvasının təmizlənməsində iştirak etdi. Qələbəmizin lap yaxınlığında olduğuna heç bir şübhə yox idi. Onu ən ağır döyüşlərə aparan da bu inam, bu ümid idi. Fəqət Ağdərə bölgəsində, Drambon ətrafındakı döyüşlərdə düşmən qəlpəsi həmişəlik söndürdü bu gözlərdəki sonsuz ümid qığılcımlarını.

Onun ölümü atası Fəzi kişini xeyli sarsıtsa da, son anda özündə bu dərdə dözüm tapdı. Bu dəfə o, üzünü ikinci oğluna, Yasiflə bir batalyonda xidmət edən Vasifə tutdu. Düşməndən intiqam almağı tapşırdı.

**Mir Cəfər, “Bərdə şəhidləri”.**
***Bakı, “Sabah”, 2005. səh.128-129.***

## DƏRD ÜSTÜNDƏN DƏRD

***Aman qardaş, vay qardaş,***
***Qaşı, gözü yay qardaş.***
***Ölsə bacılar ölsün.***
***Heç deməsin vay qardaş.***

Qoşa oğul dərdindən beli bükülmüş atanın, dərd-qəmdən qara saçlarına qar ələnmiş bədbəxt ananın, bəxtəvər qardaşlı sayılan bacıların qəm yükünü yüngülləşdirmək üçün nələr etməzdi?! Cavan ikən torpağa gömülmüş iki qardaşın küskün baxışları, onun baxışlarında əks olunardı, hamımız iki qardaşımızda itirdiklərimizi Yasifdə tapmışdıq. Elə bil onunla nəfəs alırdıq.

Bir il əvvəl sevdiyi qız ilə nişanlanmışdı. Döyüşə getdiyini həmişə gizli saxlar, “Anam dözməz”, – deyərdi. Gəncliyinin belə sərt dönəmlərindən söz düşəndə həmişə anamı fikirləşirdi. Elə bil ananın dərdinin üstünə dərd qoymaqdan ehtiyat edərdi. Yeddi ay döyüşdü, neçə dəfə mühasirəyə düşdü, amma salamat qayıtdı. O gün isə... Bərdə batalyonun döyüşçüləri Drambonda 4 gün ölüm-dirim savaşına girdilər və oranı ermənilərdən təmizlədilər. Lakin bu döyüş də, itkisiz olmadı. Şəhidlik zirvəsinə yüksəlmək üçün bu batalyonda Yasiflə dostlaşmış özü kimi nişanlı olan Müşfiqlə birlikdə Vətən uğrunda şəhid oldular. Gözlərindən məhəbbət süzülən iki gənc bir anda düşmən gülləsinə tuş gəldi. Elə həmin andan yurdumun iki alagöz qızının toy xonçasına qara bağlandı. Ana-bacıların ah-naləsi ərşə dayandı. Hər çiynimdə bir qardaşın qəm yükünü daşıyırdım. Zalım fələk mənə üçüncü qəm yükünü də əsirgəmədi.

**Sənubər Məmmədova,**
***“And” qəzeti, №10(22).***
***19 mart 1993-cü il.***

## QEYRƏTLİ OĞUL İDİ

Yasif Fəzi oğlu Kərimov 1973-cü ildə Bərdə rayonun Yeni Daşkənd kəndində dünyaya gəlsə də, əslən Göyçəli idi. Valideynləri 1948-53-cü illərdə erməni təqibinə məruz qalaraq Basarkeçərdəki Daşkənd kəndindən köçüb Azərbaycanda məskunlaşmışdılar.

*Qəhərdən boğulan gözləri nəmli, taleyi qəmli, Böyük Vətən Müharibəsinin ikinci qrup əlili, şəhid atası, qaçqın Fəzi Kərimov dinimizin, xalqımızın, torpaqlarımızın təhqir olunmasına dözmürdü. Öz həmyerlilərini yurdundan didərgin düşən igid atası Məşədi Qasım Hacı Kərim oğlunun ulu Göyçənin mərd, qeyrətli oğulları ilə birlikdə əvvəllər Basarkeçərdə, sonralar Qarabağda, Malıbəyli, Xocalı uğrunda gedən döyüşlərdə mənfur yağı düşmənlərlə apardığı ölüm-dirim vuruşmasını, o vaxtkı hadisələri xatırlayırdı. O, həsrət qaldığı doğma ata-baba yurdunun xırdaca daşının, ağacının belə gözləri önündən getmədiyini, bir an belə unutmadığını söyləyir, "bir də o yerləri görəydim, sonra öləydim", – deyir.* ***(Azər Fəzi, "Vətən səsi" qəzeti, 07.05.1993)***

1988-ci ildə Göyçəlilərin Göyçədən didərgin düşməsi, atanın bir diyarda, balanın bir diyarda yeni yurd seçməsi Yasifi göyüm-göyüm göynədirdi. O, bu haqsızlığa, Moskvanın, Yerevanın bu qurğusuna heç cür dözə bilmir, daşnakların havadarlarını lənətləyirdi. Ona görə də torpaq qeyrəti, ana-bacılarımızın acı göz yaşları Yasifi Bərdə batalyonuna gətirib çıxardı. O, hərbi xidmətə yollandı. *Qeyrəti, cəsurluğu, istiqanlılığı ilə az müddətdə birinci bölüyün rəğbətini qazandı. Xoş arzuları tükənməz idi. Nişanlı olduğunu sözarası demişdi. Gözlərindən "Sənsiz keçən günlərim" intizarı oxunurdu. Qələbənin yaxınlığına heç bir şəkk-şübhəsi yox idi.* ***(Hidayət Hacıyev, "Ədalət" qəzeti, 08.09.1992)***

Döyüşlərdə Koroğlu, Nəbi qeyrəti ilə vuruşur, bir göz qırpımında düşməni al-qana boyayır, bütün əməliyyatlarda ürəklə, cəsarətlə iştirak edirdi. O, heç vaxt qorxmurdu.

*22 avqust 1992-ci ildə Yasifin Vətən eşqi ilə döyünən ürəyi daşnak gülləsinə tuş gəldi. Ağdərə rayonunun Drambon ətrafı uğrunda gedən qanlı döyüşlərdə düşmən qəlpələri həmişəlik söndürdü sayrışan sonsuz bir ümidin qığılcımlarını:*

*Ölüm necə qıydı cavan canına,*
*Torpaq şəhidini aldı qoynuna.*
*Ahımız, naləmiz uçar yanına,*
*Bir ana fəryadı səsləyər Səni!*
*Qoruya bilmədik ölümdən Səni!*

*Yasif öz şəhidliyi ilə ölməzlik qazandı, qəlblərə, ürəklərə azadlıq aşiqi kimi köçdü, əbədiləşdi. Xalqımızın azadlıq rəmzi xalısı ilmələrini al qırmızı qanı ilə bəzədi, rənglər ümmanına qarışdı, mənim, sənin, bizim, hamımızın, Vətənimizin sipər daşı oldu.*

*Vətən! Daşına, torpağına qurban olum sənin. Uğrunda ölərəmsə onda Vətənsən, Vətənimsən deyən həmin batalyonda döyüşən, kiçik qardaşı Vasif Kərimov xalqımızın azadlığı, müstəqilliyi, torpaqlarımızın bütövlüyü uğrunda döyüşü davam etdirməyi, şəhid qardaşının qanını yerdə qoymayacağını bildirir, hamını bu müqəddəs borcu yerinə yetirməyə çağırır.*

*Doğrudan da, ot kökü üstə bitərmiş. Başı qarlı, dağ vüqarlı el ağsaqqalı, müharibə əlili, dörd oğul itirmiş şəhid atası Fəzi Kərimov bu müharibədə vuruşanların və şəhid olanların hamısı mənim balam, övladlarımdır, – deyir. İndi o tək bizim deyil, hamınındır – deyə təsəlli verir, şəhidin döyüş yoldaşlarına uğurlar diləyirdi.* ***(Hidayət Hacıyev, "Ədalət" qəzeti, 08.09.1992)***

Biz Yasifin qardaşı, Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun dosenti Azər Kərimovla polkovnik Zakir Kərimovun vasitəsilə tanış olduq. Onun qardaşı haqqında söylədiyi xatirələri olduğu kimi qələmə aldım:

*– "Şəhid qardaşımla ölümündən bir həftə əvvəl kəndimizə gedən yolda rastlaşmışdıq. Bu onunla son görüşümüz oldu. Mən Bakıdan evə, o isə hərbi formada rayona, batalyona növbəyə gedirdi. Gözlərimə inanmadım, dünənə qədər uşaq bildiyim qardaşım necə böyüyüb məğrurlaşmışdı. Üzündən, gözündən nur tökülür, hərbi forma onun cəngavər görkəmini bir az da cazibədar edirdi. Ayrılanda bir şəkil verdi mənə. Xatirə saxla, dedi. Ayrıldıq! Mən kənddəki evə, doğmalarla görüşə, o isə Vətənin keşiyində əbədi qalmağa gedirdi. Adətən biz bir-birimizlə evdə görüşməyi adət etdiyimizdən qürub çağı bizi ayıran bu görüşdən bir üşütmə keçdi ürəyimdən. Bu taleyinə şəhidlik qismət olan qardaşım Yasiflə son görüşüm idi... Dəfn zamanı şəhidin Bakıya, Şəhidlər Xiyabanına aparılması təklifini eşidən atam, onu el qəbiristanlığında uyuyan qardaşlarından ayırmayacağını bildirdi. "Bu şəhid qanı tökülən torpaqlarımızın unudulub sahibsizləşməsi olardı. Məgər, şəhid ruhu üçün Vətənin hər qarış torpağı müqəddəs deyilmi?" – dedi.*

*Az keçmədən kənd camaatı daha bir sarsıdıcı xəbər eşitdi. Qısa ömür kitabını qəhrəmanlar salnaməsi ilə tamamlayan elimizin qeyrətli oğlu, polis baş serjantı Ziyafət Balıyev Ağdərədə şəhid olmuşdur. Taleyin hökmünə bax ki, sağlığında qoşa gəzən igid əmioğlular el qəbiristanlığında da qoşa oldular."*

**Qədir Aslan,**
***«Göyçə şəhidləri» kitabı,***
***Bakı, «İşıq», 1997. səh.180-183.***

## CƏSUR DÖYÜŞÇÜ

***Bu şərəfli ömür yolu,***
***Çox çəkmədi, qısa oldu.***
***Ailənin sevimlisi,***
***Bütöv elə örnək oldu.***

Yasif Fəzi oğlu Kərimov 1973-cü ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində anadan olub. Orta təhsilini 1990-cı ildə başa vurduqdan sonra "Göyçə" kolxozunda ilk əmək fəaliyyətinə başlayıb. Daha sonra Bərdə özünümüdafiə batalyonuna üzv olub. Az müddətə hərbi sirləri öyrənən Yasif hərbi silahların sirrini hələ orta məktəbdə oxuyarkən yaxşı mənimsədiyindən "ot kökü üstə bitər", – deyiminin doğruluğunu sübut etdi. Atasının, babasının yüksək atıcılıq qabiliyyətinə malik olduqları kimi, o, da silahların sirrini öyrənmişdir.

**Haşiyə:** Hələ 1917-ci illərdə babası Məşədi Qasım Göyçə mahalında erməni-müsəlman davasında mənfur ermənilərə qarşı vuruşlarda igidliklər göstərmiş, özünə dəstə toplamış, Qarabağda gedən döyüşlərdə iştirak etmək üçün öz dəstəsi ilə birlikdə Ağdamın Xocalı kəndinə gəlmiş, ermənilərə divan tutmaq üçün gecəsini gündüzünə qatmış, bir sözlə böyük igidliklər göstərmişdir. Ona görə də Məşədi Qasım adı həmişə vətənpərvərlər üçün örnək olmuşdur.

Atası Fəzi Kərimov uzun müddət kolxoz quruculuğu ilə məşğul olmuş, baş mühasib, kənd sovetinin sədri kimi bir çox vəzifələrdə işləmiş, Böyük Vətən Müharibəsi iştirakçısı, gözəl ağsaqqal, yüksək təbə malik şair olmuşdur. Şeir toplusu çox gec nəşr olunsa da, oxucuların rəğbətini qazanmışdır.

1941-1945-ci il Böyük Vətən Müharibəsinin rəşadətli döyüşçüsü olmuş, dəfələrlə yaralansa da, yenə də qaynar döyüş nöqtələrində iştirak etmiş, neçə-neçə döyüşlərdə yüksək döyüş nümunəsi göstərdiyinə görə, müxtəlif döş nişanları, orden və medallara layiq görülmüşdür. Müharibədən sonra doğma kəndi ulu oğuz yurdu olan Göyçə mahalının səfalı guşəsində yerləşən Daşkəndə qayıtmış və əmək fəaliyyətinə başlamışdır. Harda olursa-olsun Fəzi Kərimov yeni nəslə örnək olmuşdur. 1953-cü ildə ermənilərin növbəti siyasi (repressiya) oyunlarına son qoymaq üçün əlindən gələni etsə də, artıq o torpaqda yaşamağın mümkünsüzlüyünü görüb öz dədə-baba yurdunu tərk edərək, Bərdə rayonunun Yeni Daşkənd kəndinə köçmüşdür. Gözəl ağsaqqal, şair Fəzi Qəmgin kənddə Böyük Vətən Müharibəsi iştirakçıları birliyinin öndəri, Ağsaqqallar Şurasının sədri olmaqla kəndin bütün xeyir və şər işlərində bir ağsaqqal kimi özünəməxsus yer tutmuşdur. Qarabağ müharibəsi başlayanda gecələri yatmayan Fəzi Kərimov vətənin müdafiəsinə cavanların yolasalma mərasimlərində öz müsbət fikirlərini gələcək əsgərlərə çatdırmağı özünə borc bilən bir ağsaqqal kimi kənd ziyalılarının hörmətini qazanmışdır. Lakin Yasifin ölüm xəbəri Fəzi dayını çox sarsıtmışdır. Xalqın təkidi ilə o, kəndin özünümüdafiə dəstəsinə rəhbərlik edirdi.

Yasif Fəzi oğlu da ata-babasının irsini davam etdirərək, Bərdə özünümüdafiə batalyonunun üzvü olaraq tez bir zamanda hərbi sirlərə yiyələnməyə nail oldu və komandanlıq tərəfindən verilən bütün tapşırıqları yerinə yetirərək hamının sevimlisinə çevirilirdi. Çünki batalyonun ən gənc, cəsur döyüşçüsü idi. Az müddətdə döyüş əməliyyatlarında

düşmənlə üz-üzə gəlməkdən çəkinməməsi və qorxmazlığı, mətinliyi onu Ağdərənin Drambon kəndi ətrafında gedən döyüşlərə çəkib apardı. Elə bil ki, alın yazısı imiş onun şəhidlik zirvəsinə ucalması. Gənc döyüşçü Yasif Fəzi oğlu bütün döyüşçülərin gözü qabağında erməni quldurlarına qarşı üzbəüz vuruşmaların birində alın nahiyəsindən aldığı qəlpə yarasından əbədiyyətə qovuşdu.

Təhsil aldığı Bərdə rayon Yeni Daşkənd kənd orta məktəbi indi Yasif Fəzi oğlu Kərimovun adını daşıyır. Şagird və müəllim kollektivi onun döyüş rəşadətini əks etdirən guşə önündə həmişə tər çiçəklərin olmasını özlərinə borc bilirlər.

***Mübarizdi, mətin idi,***
***Onu duymaq çətin idi.***
***Fikri-zikri qələbəydi,***
***Heyf, qəlpəyə tuş oldu...***

**Səyyad Şairov,**
***"Yaralı Göyçə" kitabı,***
***Bakı, "Nurlan", 2006. səh.28-30.***

## YASİF KƏRİMOVU XATIRLARKƏN

Yasif mənim əmim – ağsaqqalımız, şair Qəmgin Fəzinin oğludur. Yasif həm də mənim ən əziz şagirdlərimdən biri olub. O, mənim xatirimdə çox səmimi, tərbiyəli, gülərüz bir şagird kimi qalıb.

Yasif kəndimizin ilk şəhididir. Onun şəhidliyi, qəhrəmanlığı soykökümüzdən gələn bir haldır. Belə ki, babamız Məşədi Qasım, atası Qəmgin Fəzi öz igidlikləri, qoçaqlıqları ilə hər yerdə tanınmışdılar. Ona görə də Yasifin qəhrəmancasına şəhid olması təbii bir haldır. Yasif ilə bağlı çoxlu xatirələrim var, onlardan birini sizinlə bölüşmək istəyirəm.

Rəhmətlik Fəzi əmim II Dünya Müharibəsinin veteranı olduğu üçün ona "Zaporojest" markalı maşın vermişdilər. Yasif rəhmətlik həmin maşınla nişanlısını görməyə gələrdi.

Bir dəfə mən Yasifin maşını döndərə bilməyib, arxasını su ilə dolu arxa saldığını gördüm. Yasif kənardan çömbəlib maşına baxırdı. Soruşdum ki, nə olub? Dedi, müəllim, döndərə bilmədim, maşının arxa tərəfi arxa düşüb əzilib. Mən yaxınlıqdan keçən uşaqları çağırdım, köməkləşib maşını çıxartdıq. Soruşdum ki, Yasif, dədən (Yasif atasına dədə deyirdi) maşının əziyini görsə, nə deyəcəksən? Gülə-gülə dedi ki, müəllim, əzik tərəfi qarajın qaranlıq yerində saxlayacam. Hamı gülüşdü, o isə bizə sağ ol deyib getdi.

Çox təəssüf ki, Yasif bu gün aramızda yoxdu, kaş sağ olaydı, maşını yenə arxa salaydı. Yasifin əziz xatirəsi daima qəlbimizdə yaşayacaq.

Allah Yasifə və bütün şəhidlərimizə rəhmət eləsin!

**Ələddin Balıyev**
***Yasif Kərimov adına Yeni Daşkənd kənd tam orta məktəbinin tarix müəllimi***

## SON GÖRÜŞ

Qaçqınlıq faciəsini 1953-cü ildən yaşayırıq. Göyçə mahalının Daşkənd yurdundan Bərdə rayonuna köçürülən-də təskinlik üçün kəndimizin adını da özümüzlə "gətirdik" – Yeni Daşkənd. Aradan xeyli vaxt keçsə də tarixin haqsız təkrarı yeni qaçqın dalğası yaratdı. Yenə də sinəmizə çalın-çarpaz dağ çəkdi. Bir insan ömrü ərzində neçə dəfə qovul-maq, yurd-yuva itirmək olar? Qardaşım Yasifi cəbhəyə aparan da bu qisas idi. Göyçə qisası, Xocalı qisası…

Onunla son dəfə görüşüm kənd yolunda oldu. Mən Bakıdan evə, o isə cəbhəyə gedirdi. Dünənə qədər uşaq bil-diyim Yasif necə də məğrurlaşmışdı. Hərbi forma onun cəngavər görkəmini daha da cazibədar edirdi. Mənim nara-hatlığım onu əsəbiləşdirsə də dinmədi, bir qədər susduqdan sonra:

– Öz torpağımızdan neçə dəfə qaçqın düşmək olar qardaş? Geriyə yol yoxdur axı, – dedi.

Bu inad, bu cəsarət Yasifi müqəddəsliyə qovuşdurdu. Avqustun 22-də Ağdərə uğrunda gedən döyüşdə şəhid oldu. Şəhidlik vətənə vurğunluğun tükənməz məhəbbətin son zirvəsi…

Bir nəğmə oxuyur,
Bülbül ömrü uzunu.
Nə haqdadır o nəğmə,
Bir kimsə bilmir bunu!
Vətən nəğməsidir,
Sevgi nəğməsidir,
Dinlə bunu, ey könül.
Olsaydı qeyri nəğmə,
Çoxdan bezərdi bulbul!

**Azər Kərimov**

***"Aydınlıq" qəzeti, №13(142). 19 mart 1993-cü il.***

## ŞƏHİD RUHU YAD EDİLDİ

***"Biz şəhid olduq ki, vətən yaşasın!"***

Aylar, illər bir-birini əvəz edir, zaman dəyişir, tarix zamanın yaddaşında özünə yer alır, yaşıdlarımız yaşlanır, qocalır, dəyişməyən isə daima yaddaşlarımızda gənc qəhrəmanlar kimi yaşayan şəhid oğullarımızdır.

Ölümləri ilə ölümsüzlük qazanan bu igidlər vətən yolunda şirin canlarından keçdilər. Yurdumuzun hər qarış torpağında neçə-neçə igid oğullarımızın qanı axıdılıb.

Respublikamızın hər yerində müqəddəs şəhidlərimizin doğum gününü, anım gününü qeyd etmək, şəhidlərin ruhuna dualar oxutdurmaq artıq gözəl bir ənənəyə çevrilmişdir. Bərdə rayonunun Yeni Daşkənd kəndində də bu ənənə 1993-cü ildən bu günə qədər hər il bütün kənd sakinləri və rayon rəhbərliyinin iştirakı ilə davam etdirilir.

1992-ci ilin avqust ayında Qarabağ döyüşlərində qəhrəmanlıqla şəhid olan 19 yaşlı Yasif Kərimov bu məktəbin məzunu olmuşdur. Ölümündən bir neçə ay sonra qədirbilən xalqımız və dövlət rəhbərimiz yurdumuzun şəhid oğluna öz layiqli qiymətini verdi.

Azərbaycan dövləti Yasif Kərimovu ölümündən sonra təltif etdi, – təhsil aldığı Yeni Daşkənd kənd orta məktəbinə onun adı verildi. Elə həmin gündən 19 yaşlı qəhrəmanımızın adı əbədiləşdirildi və ruhu əbədiyaşar oldu. Hər il mart ayının 3-də Yasif Kərimovun doğum günü məktəbdə təntənəli surətdə qeyd olunur. Yasifin əbədiyaşar ruhu məktəbliləri, kənd sakinlərini və rayon rəhbərliyini bir araya gətirir. Növbəti tədbirin təşkilində məktəbin direktoru Gülbəniz xanımın, həmçinin dil-ədəbiyyat müəllimi Gülbəniz

müəllimənin və bütün müəllim və şagird heyətinin xüsusi xidmətlərini qeyd etməyi özümə borc bilirəm.

Tədbiri giriş sözü ilə məktəbin direktoru Gülbəniz müəllimə açdı. O, hüznlü lakin şərəfli gündə qonaqları salamlayaraq şəhid Yasif Kərimov haqqında xoş sözlər söylədi. Kəndin ağsaqqalı və mollası Səməd kişi şəhidin ruhuna dualar oxudu. Kənd ağsaqqalı Böyük Vətən Müharibəsi iştirakçısı 84 yaşlı Abdulla dayı müharibə illəri ilə bağlı gənclik xatirələrini söylədi, kəndimizin qəhrəman şəhidləri Yasifi, Ziyafəti, Mehdini, Qulamı, Cəfəri, Elçini, Firudini, Eldənizi, Məhərrəmi, Rəşadəti, Ziyanı və Rəsulu gənc nəslə nümunə olaraq göstərdi. Məktəblilərin hazırladığı ədəbi-bədii kompozisiya ürəkləri kövrəltdi, könülləri oxşadı. Şair Şiruyə müəllimin bu igidləri tarixi qəhrəmanlarımıza bənzədərək yazdığı şeirləri Hilalənin, Vüsalın, Ünalın, Nurcahanın, Aytacın, Ayselin, Nərminin, Brilyantın, Aytənin, Fəridənin və Sevincin ifasında elə səslənirdi ki, hər kəsin xəyalında bu qəhrəman oğullar vətən göylərində öz möhtəşəm sıralarını tuturdu.

Yasifin atası, el ağsaqqalı şair Qəmgin Fəzinin vətən həsrətli, övlad ağrılı şeirləri və şəhidin bacısı Sənubər xanımın qardaş soraqlı şeirləri də şagirdlərin ifasında tədbir iştirakçılarını kövrəltdi.

Tədbirdə iştirak edən şəhidin anası Gülü xanım, qardaşı Vasif və bacıları tədbirdə zəhmət çəkən hər kəsə, başda direktor Gülbəniz müəllimə olmaqla bütün müəllim kollektivinə və şagirdlərə öz təşəkkürlərini bildirdilər.

**Kənan Məmmədov**,
***"Press-Media" qəzeti,***
***№14(138). 12 aprel 2010-cu il.***

# ELİN CƏSUR OĞLU

Azərbaycanın qədim şəhərlərindən olan Bərdə rayon kimi 1930-cu ildə təşkil olunmuşdır. Təmiz suyu, havası, gözəl təbiəti ilə tanınan Bərdə cəsur, qəhrəman oğulları ilə tarixən fəxr etmişdir.

Bu cəsur oğullardan biri də Yasif Fəzi oğlu Kərimovdur. 3 mart 1973-cü ildə Bərdə rayon Yeni Daşkənd kəndində Fəzi Məşədi Qasım oğlunun ailəsində yeni bir oğul dünyaya göz açdı. Fəzi babanın özü də elin-obanın ağsaqqalı idi. Oğulun dünyaya gəlməsi bütün kənd üçün şad xəbər oldu. Hər kəs ağsaqqala xeyr-dua verib "barını-bəhrini görəsən" deyirdilər. Fəzi baba oğlunun adını Yasif qoydu və "adını mən verdim, qismətini uca Tanrımız versin" - dedi. Amma bilməzdi ki, balasının həyat yolu belə qısa olacaq.

Yasif böyüdü, orta məktəbi bitirdi və sıra Vətən qarşısında olan borcunu yerinə yetirmək məqamına gəlib çatdı. Hərbi xidmətə yollandı. Vətəni qarşısında olan borcunu layiqincə yerinə yetirdi və Ağdərə bölgəsində şəhid oldu. Əsgərlikdə olarkən nişanlı olduğunu heç kəsə deməmişdi. Sanki torpağı uğrunda şəhid olmaq Yasif Kərimovun qəti fikri idi. O, tez-tez Bakıya gəlib “Şəhidlər Xiyabanı”nı ziyarət edərdi və yeni bir öhdəlik götürərək döyüşə qayıdardı. Döyüşə gedərkən nişanlısına yalnız anasını tapşırardı. Komandir Yasifin nişanlı olduğunu biləndən sonra (1992-ci il avqust ayında) göstəriş verir ki, Yasif döyüşə getməsin, yaxında toyu olacaq. Amma Yasif bu göstərişlə razılaşmayıb Ağdərə uğrunda gedən döyüşlərdə iştirak edəcəyini bildirir. Bu Yasifin döyüşdə son iştirakı olur.

O, Ağdərə bölgəsində torpaqlarımızın azadlığı uğrunda canından keçərək şəhid oldu. Zalım, amansız, vəhşi düşmən gülləsi ürəyində sevgisi gül açmamış Yasifin ömrünə son qoydu. Bir el qızının xonçasına qara bağlandı, ana-bacı naləsi ərşə ucaldı. Yer-göy titrədi Yasifin ölümünə. Çiynində daşıdığı 3 oğul itkisinin ağırlığına tab gətirməyən Fəzi baba da dünyasını dəyişdi, oğlanlarına qovuşdu.

Torpaq, əgər uğrunda ölən varsa Vətəndir!

Allah bütün şəhidlərə rəhmət eləsin!

**Fərqanə Mehrabova,**
***“Respublika gəncləri” qəzeti,***
***№9(265). 18 mart 2008-ci il.***

## KƏRİMOV YASİF FƏZİ OĞLU

Kərimov Yasif Fəzi oğlu 03.03.1973-cü ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində doğulmuşdur. Azərbaycanlı. Bərdə Rayon Hərbi Komisarlığından Milli Orduya çağırılmışdır (24.03.1992). Sıravi əsgər, 18136-cı hərbi hissənin avtomatçısı. Ağdərə rayonunun Drambon kəndində həlak olmuşdur (22.08.1992). Yeni Daşkənd kəndində dəfn edilmişdir. Adına məktəb var.

***Azərbaycan Respublikası Xatirə Kitabı,***
***VII cild, K, Q (Q...-Qaz.) hərfləri,***
***Respublika Xatirə Kitabı Redaksiyası,***
***Bakı, 2007. səh.233.***

## ONLAR ŞƏHİDLİK ZİRVƏSİNƏ UCALDILAR

*Bayraqları bayraq yapan üstündəki qandır,*
*Torpaq, əgər uğrunda ölən varsa Vatandır!*
**Mithat Camal Kuntay**

**Dostlar qara geysin ağlasın barı,**
**Yurdumun bir igid balası getdi.**
**Bir ata qəlbinin fəxri, vüqarı,**
**Bir ana qəlbinin parası getdi.**

Yel qanadlı illər bir-birini əvəz etdikcə yaşımızın üstünə yaş gəlir. Ömrün axar-baxarlı çağları geridə qalır. Yaşa dolub müdrikləşdikcə öz vicdanımız qarşısında daha çox haqq-hesab verməli oluruq. Bəzilərimiz bu vicdani sorğular qarşısında aciz qalır, bəzilərimiz bu sınaqdan alnı açıq çıxırıq. Bəzilərimizsə qısaca ömrümüzlə zamanın yaddaşına elə bir tarix yazırıq ki, üstündən yüzilliklər keçsə belə həmişə xatırlanır, ürəklərdə əbədi olaraq şirin xatirələrə dönərək yaddaşlardan-yaddaşlara ötürülür, gələcək nəsillərə örnək oluruq. Bizim qəhrəman vətən şəhidləri kimi!

Şəhidlər ölmədilər, onlar da ölümləri ilə ölməzlik əfsanəsinə çevrildilər. Mənfur qonşularımızla qeyri-bərabər döyüşlərdə şəhid olan qəhrəman oğullarımızın müqəddəs məzarları yurdumuzun hər guşəsini bir qəhrəmanlıq qalasına çevirib. Vətənimizin bütövlüyü uğrunda şəhid olan igidlərimizin xatirəsi xalqımız və dövlətimiz tərəfindən daima anılır. Bu günlərdə Bərdə rayonu Yasif Kərimov adına Yeni Daşkənd kənd orta məktəbində, məktəbin məzunu şəhid Yasif Kərimovun doğum günü təntənəli şəkildə qeyd olundu. Yasif Kərimov 1992-ci il avqust ayının 22-də Ağdərənin Drambon kəndi uğrunda gedən döyüşlərdə igidliklə

şəhid olmuşdur. Artıq 20 ilə yaxındır ki, Yasifin doğum günü təkcə ailə çərçivəsində deyil, bütöv rayon səviyyəsində Yasifsiz qeyd olunur. Rayon rəhbərliyi, Təhsil şöbəsinin nümayəndələri, kənd ağsaqqalları, şəhidin döyüş yoldaşları, kəndimizin gəncləri hər il olduğu kimi bu il də şəhidin ailəsini yalqız buraxmadılar. Adını daşıyan məktəbdə düzənlənən bu anım törənində Yasifin timsalında bütün şəhidlərin ruhuna dualar oxunur, xatirələr dilə gətirilirdi.

Hər il olduğu kimi bu anım günündə də məktəbin direktoru Gülbəniz xanım ev sahibi olaraq qonaqları salamladı, şəhidin doğum günü münasibətilə ailə üzvlərinə ürək sözlərini çatdırdı. Bu gün xalqımız Yasif Kərimov kimi igid oğullarımızla fəxr edir. Məktəbimizin hər bir şagirdi hər gün Yasifin xatirə lövhəsi qarşısında bir anlıq ayaq saxlayır, onun döyüş yolunu xatırlayır əziz xatirəsi önündə baş əyir. Qeyd etmək yerinə düşərdi ki, məktəbin şagirdlərinin son dərəcə yüksək vətənpərvərlik ruhunda tərbiyə almalarında şəhid oğullarımızın rolu təkzibolunmazdır. Məktəbin şagirdləri Hilalə, Aytən, Vüsal, Aysel, Ünal, Leyla, Turanə, Əfsanə, Ümid, Aytac, Sevinc, Səbinə, Humay, Nurcahan, Gözəl, Nərmin, Mövla və başqalarının iştirakı ilə məktəbin müəllimәsi Gülbəniz Mirzəyevanın hazırladığı ədəbi-bədii kompozisiya yurdumuzun bütün şəhidlərinin qəhrəmanlığını geniş şəkildə əhatə elədi. Şəhidin döyüş dostları Elmir, Camal, Xəyyam, Rizvan, Aqil, Vasif, Mürvət, Aqşin, Kamran, Raqif, Niyaz, Nadir, Adil, Rafiq və başqaları Yasiflə bağlı xatirələri, onunla bağlı anıları bir daha yaxınlarına yaşatdı. Şagirdlərin bu eldən gedən şəhid oğullar haqqında söylədikləri şeirlər bu elin oğullarının qəhrəmanlığını obrazlı şəkildə hər kəsə çatdırdı.

Bu eldən şəhid gedib,
Hər biri bir nər idi.
Bu eldən şəhid gedib,
Hər biri bir ər idi.

Bu eldən igid gedib,
Cəmi igidlər gözü.
Babası Qasım kişi
Düşmənə sərtlik üzü.

Ziyafəti görənlər,
Budur Beyrək dedilər.
Vuruşunu görənlər,
Əgrək, Səgrək dedilər.

Eldən Eldəniz gedib,
Dəli hünər Qantural.
Dağ kəlini boğduğu,
Həqiqətmiş bu xəyal.

Bu eldən Cəfər gedib,
Düşmənə qanlı bıçaq.
Vətənə, xalqa bağlı,
Həm kamallı, həm qoçaq.

Bu eldən Mehdi gedib,
Cəsur, qorxmaz, yenilməz.
Babası Hacı Rəhim tək
Yüz düşmənə əyilməz.

Bu eldən Ziya gedib.
Dəli Domrul hünərdə.
Əzrayılla güləşib,
Yerdə, göydə, səngərdə.

Bu eldən Qulam gedib,
Aruz oğlu Basat xan.
Gündə üç adam yeyən,
Təpəgözdən alıb qan.

Şir Şəmsəddin ürəkli,
Firudin gedib əldən.
Basat, Bəkil ürəkli,
Firudin gedib əldən.

Eldən Rəşadət gedib,
Hünər, qeyrət rəmzidir.
Eldən Rəşadət gedib,
Bir cəsarət rəmzidir.

Elçinin yerişinə,
Dəli vuran dedilər.
Meydana girişinə,
Salur Qazan dedilər.

Məhərrəm gedib eldən,
Qəlbi bəbir, ürəkli.
Məhərrəm gedib eldən,
Zəfər, hünər diləkli.

Rəsul gedibdir eldən,
Arzuları tər qönçə,
Olmayıbdı imkanı,
Sevgi sözü dilində.

Vətəndən qəbirləri,
Qərib düşən igidlər.
Rəşid ilə düşmənin
Bağrın dələn igidlər.

Gedibdir Ələsgər tək,
Bizə şöhrət, şan eylər.
Kəlbəcər həsrətiylə,
Kəlbəcərdə qan eylər.

Bilinmədi, nə oldu
Daşqın düşdü daşqına.
Bir çəkilməz dərd oldu,
Vətənindən qaçqına.

Elşən də Daşqın yollu,
Elşən də bəd taleli,
Yas donuna büründü,
Qaçqın oldu bir elli.

Tədbirin sonunda bütün şəhidlərin ruhuna dualar oxundu. Allah bütün şəhidlərə rəhmət eləsin!

**Fərqanə Nürəddinqızı,**
***"Göyçənin səsi" qəzeti,***
***№1 (01). 11 aprel 2011-ci il.***

## QARABAĞ QAZİLƏRİ İLƏ GÖRÜŞ

Şəhid Yasif Kərimovla bağlı hazırladığım “Ömrün şəhidlik zirvəsi” adlı kitabda onun döyüş yoldaşlarından da bir-neçəsinin fikirlərini yazmaq istəyirdim. Bu məqsədlə 4 avqust 2012-ci ildə doğulduğum Yeni Daşkənd kəndində bir sinifdə oxuduğumuz Qarabağ müharibəsi veteranları Aqil Əliyev və Elmir Şıxəliyevlə görüşdüm, birlikdə məktəbimizin qarşısında ucaldılmış Yasifin əzəmətli büstünü, daha sonra isə məzarını ziyarət etdik. Söhbətimizin məğzi ancaq rəhmətlik Yasifdən idi. Onların xatirələrindən bəzi məqamları qələmə aldım.

**Aqil Əliyev:** 1992-ci il avqustun 18-də hərbi hissəmiz Bərdədən döyüş bölgəsinə gedərək Kasabetdə mövqe tutdu. Kasabet Drambondan hələ xeyli bəridir. Bir gün qaldıqdan sonra biz hücuma keçdik. Kasabetin hardasa içindən 3 km gedəndən sonra “Pioner” heykəlinin yanına çatdıq. Ordan dolama yol başlayır. Artıq avqustun 19-u idi. Orada ermənilər bizim əsgərlərə tələ qurmuşdular. Yayın istisində əsgərlər susuzluqdan əziyyət çəkirdi. Hər tərəf meşə idi. Onda gördük ki, ermənilər minomyotlardan atırlar. Heç ara vermirdilər, dəqiq bilinmirdi ki, mərmilər hansı tərəfdən gəlir. Belə olanda komandir əmr verdi ki, bir qədər arxaya çəkilin. Məlum oldu ki, bizi mühasirəyə alıblar. Atışma zamanı bizim və Hacıqabul batalyonundan şəhid olanlar, yaralananlar oldu. Sonra biz yenə mövqeni dünənki yerdə qurduq. Ayın 20-si bizi sıraya düzüb dedilər ki, indi dünənkindən də pis ola bilər. Yasif məndən sonra xidmətə gəldiyindən döyüş zonasında hələ çox olmamışdı. Yasifgil təzə çağırışçı olduqlarına görə onlara dedilər ki, kim qor-

xursa, döyüşə girməsin. Heç kim qalmaq istəmədi, hamı dedi ki, döyüşə bərabər gedəcəyik. Təzədən biz yenə Kasabetə girdik. Bu dəfə nəsə döyüş olmadı. Kəndə rahatca girdik. Artıq gecə idi. Kasapetin çıxacağında "Pioner" heykəlinin yanında biz post qurduq, gecə orda qaldıq. Ayın 21-də səhər-səhər həyacan siqnalı verdilər, dolanbac yollarla başladıq qalxmağa. Hər tərəf meşə idi. 150-200 nəfər əsgər olardı, tankımız da var idi. Hiss etdik ki, bizi görüblər, biz olan yerə atırlar, dəqiqəyə bir qrad mərmisi düşürdü. Gah uzanır, gah da sürünə-sürünə hərəkət edirdik, onlar bizi hardansa görürlərmiş. Bizim batalyonun yarısı həmin yerdən tez keçib getdi. Arxamızca gələn batalyonlar daha çox itki verdi. Artıq Mehmanə kəndinə çatırdıq. Kəndin yaxınlığında kəşfiyyatçılar var idi. Onlar bizə dedilər ki, burda ermənilər var. Biz gələndə burada Gəncə, Goranboy və Tərtər batalyonları da var idi. Batalyonlar bir-biriylə xeyli məsləhətləşdilər, onlar da bizə qoşuldular. Bərabər endik "Turbaza" deyilən yerə. Birləşəndən sonra ən azı 400 nəfər olduq. Bizə əmr verdilər ki, gedirik Drambona. Qərargah rəisi "Azərbaycan bayrağı" ordenli Sərhəd Zöhrabbəyov bizim komandir idi. Gəncədən Azərbaycanın Milli Qəhrəmanı Ənvər Arazov da orada idi. Hələ o bizi öyrədirdi ki, su tapılmayanda sütül fındığı qırıb onun şirəsini için. Səhər saat 8-dən yol gedirdik – ən azı 30 km getmişdik. Drambona 5 km qalırdı, 400 nəfər əsgər, zabit bir-birinə qarışmışdı. Bəlkə də əsgərlərin əvvəlindən axırına hərəkətin uzunluğu 2 km olardı.

Biz "Ayı" heykəlinin yanına çatanda komandirlər plan qurdular ki, bütün Bərdə batalyonu dərəylə Drambonun arxa tərəfinə keçsin. Goranboy və Gəncə batalyonları isə

başqa tərəfdə mövqe seçsinlər. Bərabər hücum edib kəndi tutmalı idik. Biz dərəyə düşəndə qarışıqlıq olduğundan öz uşaqlarımızı səslədik. Bizə dedilər ki, sizin uşaqlar getdilər. “Ayı” heykəlinin yanındakı dərədən qalxıb dağla fırlanıb keçirdik ki, onda gördük meşəlikdən qradla atırlar, amma biz elə yerdə idik ki, qabağımızı təpə kəsirdi, həm də ora “S” şəkilli bir yer idi. Bəlkə də dəqiqəyə 3–4 mərmi düşürdü. Bizim tankın birini orda vurdular. Komandirlər dedilər ki, gecə burada qalmaq olmaz, geri çəkilmək lazımdır. Gəldik Uluqarabəy kəndinin üst tərəfinə.

Bizim kəndin uşaqlarından Yasif Kərimov, Müşfiq Məmmədov, Adil İsmayılov, Kəmaləddin Kərimov burada idi, başqa kəndin uşaqlarından da vardı. Kapitan Qədimovun göstərişi ilə gecəni orada qaldıq. Səhəri dedilər ki, gedirik döyüşə. Biz gördük ki, Yasifin ayağını krosovka döyüb, yaxşı yeriyə bilmir, mənə dedi ki, Aqil ayağım məni yaman incidir, mən də dedim ki, getmə. Gedib Qədimova da dedim ki, Yasifin ayağı narahatdır. O, da qayğıkeşliklə bildirdi ki, ayağı ağrıyır getməsin, kimdir ona nə deyən.

Gəlib Yasifə dedim ki, icazə aldım, sən qal burda.

O qaldı. Artıq ayın 22-si idi. Biz 2 km yol gəlib “Turbaza”dan düşüb asfalt yola çatanda gördük ki, Yasif bir “QAZ–66”-da gəlir. Dedim ki, Yasif niyə gəldin? Cavab verdi ki, yox ey, ürəyim durmadı, sizdən ayrı qala bilmərəm, mən də gedirəm.

Nə qədər elədik qayıtmadı. Maşından düşüb bizə qoşuldu. 4 km də gedib o yerə çatmışdıq ki, dünən ermənilər bizi o dərədə bombalamışdılar. Amma indi heç nə yox idi. Sən demə, ermənilər güdükdə durublarmış. Saat 11-12 olardı. Mal ətindən konservimiz var idi, açdıq ki, bir qismət

çörək yeyək, yenə yolumuza davam edək. Ona kimi bizim batolyondan iki könüllü əsgər gəldi ki, sizi aparacam öz batalyonumuzun yanına, biz dünən qayıtdığımızdan ayrı düşmüşdük, yolu da tanımırdıq. Həmin an həyacan siqnalı verildi. Tez özümüzü verdik dərəyə. 40-50 nəfər olardıq. Demək dünəndən erməni oranıca gözləyirmiş. Elə dərəyə girmişdik ki, ermənilər bir neçə növ iri çaplı silahlardan yağış kimi yağdırmağa başladılar. Biz də onlar atan istiqamətə silahlarımızdan atəş açırdıq. Qızğın döyüş başlamışdı. Yasif Kərimov atışa-atışa bizdən qabaqda gedirdi. Ora elə bir yer idi ki, qarmona oxşayırdı. Çökəkdə olanda 10 m qabaqdakını görmürsən, o da, sən də hündür yerdə olanda lap 50 m-dəkini də görmək olurdu. Hamımız sürəti artırdıq ki, oranı tez keçək. Ora hədəf imiş. Mənim yanımda xaxol-rus uşaqlar da var idi. Kəmaləddin də yanımda idi. Mən Yasifi görmürdüm, çünki o qabaqda gedirdi. Bərdəli Faiq, Müşfiq də onun yanında olub. Adildən, Müşfiqdən, Yasifdən, məndən qabaqdakılardan xəbərim olmadı. Gördüm ki, Kəmaləddin Kərimov ağzı üstə yıxılıb yerdə çabalayır, yaralıdır, qolundan qan gedirdi. Kəmaləddini qaldırıb geriyə çıxartdım, onda gördüm ki, bir xaxol da yaralanıb, qolunu tutub qaçır. Mən özüm də yaralanmışam, amma hələ xəbərim yox idi. Qırağa çıxdım ki, 10-a qədər adam qaya kimi bir yerə söykənib durublar. Hərənin bir yeri yaralanıb. Ona kimi təcili yardım gəldi. Onu da deyim ki, 50 nəfərdən ölənlər də oldu. Mən elə bildim ki, Yasifgil keçib gediblər və bizim batalyona çatıblar. 3 təcili yardım maşınında yaralıları yola saldıq. Mən istəyirdim ki, başqa istiqamətdən keçəm o tərəfə, gördüm ki, oranı da vurublar, yaralılar da var. Həkimin biri mənə dərman içirtdi. Axırıncı

təcili yardım maşını qalmışdı. Vüqara dedim ki, mənim kürəyim yaman ağrıyır. O da dedi ki, sənə də qəlpə dəyib.

Dedim: – Ola bilməz, əlini kürəyimə çəkib qanı mənə göstərdi.

Qrad atılanda mən ağzı üstə uzanırdım, onda kürəyimdən qəlpə dəyibmiş. Həkim dedi ki, sən də min təcili yardım maşınına. Dedim ki, ağır yaralıları apar, mən yüngül yaralıyam. Nəsə... yaralıları götürdük, yer olduğundan mən də mindim. Gəldik Kasabetdə Bərdəli Faiq dedi ki, – "Yasif Kərimov şəhid oldu. Mən bilməzdim ki, Yasif belə ürəkli oğlandı. Qəti qorxub eləmirdi. Ayaq üstə atışırdı düşmənlə. Onu qəlpə tutdu." Ona kimi mən də elə bilirdim ki, Yasif keçib gedib bizim batalyonun uşaqlarına çatıb. Sən demə, elə oradaca qəhrəmancasına şəhid olub. Allah sənə rəhmət eləsin Yasif. Hələ də inana bilmirəm onun yoxluğuna.

Onu da deyim ki, biz 2–3 gün qabaq Kasabetdən Drambon istiqamətinə gedəndə dağın döşündə uzaqda bir neçə erməni gördük. Qulam Qədirov dedi ki, qrantamyotla vurum, komandirlər dedilər ki, 3–4 erməndidi, bəlkə də bizimkilərdi, vurmaq olmaz. Sən demə bizi səhərisi onlar vurur, hələ qabağa da onlar xəbər verirlərmiş ki, Azərbaycan əsgərləri gəlir. Drambon kəndinin alt tərəfi Sərsəng su hövzəsi, yuxarı tərəfi isə Mehmanə kəndi idi. Mənim fikrimcə səhvimiz onda oldu ki, əvvəlcə Mehmanə alınmalı idi. Kiçik kənd olmasına baxmayaraq erməni silahlı qüvvələri orada cəmlənmişdi.

Bu döyüşlər ən ağır döyüşlər idi. Göyçəli Milli Qəhrəman Şövqiyar Abdullayev də bizdən bir-iki gün sonra orda vurulmuşdu. Özü də hələ o peşəkar hərbçi idi. Ağda-

mın tank batalyonunun komandiri idi. Biz yaralanandan bir neçə gün sonra Kəlbəcər yolu açıldı. Deyirdilər ki, hələ belə ağır döyüş olmayıb. Amma onu da deyim ki, ermənilər də bu döyüşdə çox itki verdilər.

**Elmir Şıxəliyev:** Yasiflə mən Aqilgillə getməli deyildik. Çünki bizim təlimlər hələ qurtarmamışdı. Əynində hərbi paltar, əlində avtomat, ayağında krosovka minib avtobusa, mənə də əl elədi, çağırdı ki, gəl görüşək, hər şey ola bilər, mən gedirəm döyüşə. Avtobusun açıq pəncərəsindən əl-ələ görüşdük. O, nişanlı olduğu üçün onu əsgər yoldaşlarımız buraxmırdı. Həm də qardaşı Vasif də bizim batalyonda idi. İki qardaşın birdən döyüş bölgəsinə getməyi məsləhət deyildi, hər şey ola bilərdi. Yasif çox ciyərli, ürəkli uşaq idi. Eləcə istəyirdi ki, döyüşə girsin. Hər gün hərbi hissəmizin uşaqlarından yaralanan olurdu. Yasif heç cürə dincəlmirdi ki, – Ə, bizi niyə qoymurlar döyüşə gedək.

Bizi ancaq hərbi hissədə təlimlərdən sonra keşikçi qoyurdular. Biz özümüz də komandirlərə müraciət edirdik ki, bəs nə vaxt döyüşə aparacaqsız? Ruh yüksəkliyi çox böyük idi. Onlar deyirdilər vaxtı var, gedəcəksiniz. Günün birində, yəni 1992-ci il avqustun 18-də uşaqlarla siqaret çəkirdik. Birdən səs eşitdim: “Ayə Elmir, dur bəri gəl, dur bəri gəl.” Çönüb baxdım ki, Yasif avtobusun lap arxa oturacağında oturub pəncərədən məni çağırır. O, özü arxada oturmuşdu ki, komandirlərin gözünə dəyməsin. Yoxsa onu qoymazlar. Həm təlimdə olan əsgər kimi, həm də iki qardaş xidmətdə olduqlarına və həm də nişanlı olduğuna görə. Amma ən əsası o idi ki, biz təlimdə idik. Yasifdəki bu hiss özündən asılı deyildi, vətənpərvərlik onun genində, qanında var idi. Allah babası Məşədi Qasıma rəhmət eləsin,

haqqında çox eşitmişik. 1918-1920-ci illərdə ermənilərə qarşı döyüşüb. Məşədi Qasım Göyçədən döyüşə-döyüşə gəlib Əsgərana. Onun ad-sanı Türkiyəyə gedib çıxan sərkərdə olub. Atası Fəzi kişi 1941-1945-ci il müharibəsinin ən sayılan döyüşçülərindən olub. Böyük Vətən Müharibəsi veteranı idi, topçu olub, 8 güllə yarası alıb. O, bizə deyirdi ki, – "A bala, qorxub eləməyin, erməni nə millətdi ki, ondan qorxasız. Onları qovub torpaqlarımızdan çıxarın." Bax Yasifdəki bu hiss ordan gəlir. Yasif ayrı çür də ola bilməzdi. Hələ Yasiflə bərabər kiçik qardaşı Vasif də döyüşürdü. Çox vaxt onu saxlayırdılar ki, birdən birə ikiniz də döyüşə getməyin, hər şey ola bilər.

Allah Yasifə rəhmət eləsin, uşaqlığımız bir yerdə keçib. Əla yoldaşlığı var idi. Canlara dəyən dostum cənnətməkan oldu. Çox insanlar bu dünyaya gəlib-gedib, unudulub, amma Vətən uğrunda şəhid olanlar heç vaxt unudulmayacaq.

**Söhbəti qələmə aldı: Araz Hacıyev**

**Sənubər Fəziqızı**
***"Göyçənin səsi" qəzetinin***
***təsisçisi və baş redaktoru***

## AY ANA

***Şəhid qardaşım Yasifin dilindən***

Qərib yerə, yad diyara düşmüşəm,
Əlim çatmır dost-düşmənə, ay Ana!
Hey istərəm sənə xəbər yetirəm,
Ələ keçməz bir kimsənə, ay Ana!

Əzabını hiss edərəm, duyaram,
Qibləgah tək sənə səcdə qılaram.
Səhər erkən oyanaram, duraram,
Əlim çatmaz neynim sənə, ay Ana!

Yaman yerdə fələk bizi ayırdı,
Toy xonçam da, yas boxçası sayıldı.
İsti yerim mənə indi bayırdı,
Deyə bilməm bunu sənə, ay Ana!

Ağıların məni yandırıb-yaxar,
Olsa idi məndə bir az ixtiyar.
Verəcəkdim bir kiçicik yadigar,
Saxla bunu mən gələnə, ay Ana!

Elmiramı çıxarmaram yadımdan,
Güllə dəyib keçdi yeddi qatımdan.
Mən dönmərəm əsilimdən, zatımdan,
Soraqlaram dönə-dönə, ay Ana!

***1 oktyabr 1992-ci il.***

## UNUDULMAZ İGİDİM

***Şəhid qardaşım Yasifə ithaf edirəm***

Taleyindən qara yellər əsdimi,
Yağı düşmən dörd yanını kəsdimi,
Fələkdənmi yoxsa eldən qəstdimi?
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

Qardaş dedim qara bağrım dəlindi,
Qara geyən sən sevdiyin gəlindi.
Daş altdakı səninmi əllərindi,
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

Üzündə ay doğub, yaz açılmışdı,
Hüsnünə min heyran göz açılmışdı,
Qara taleyindən söz açılmışdı,
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

Sən Vətənə dönük çıxa bilmədin,
Alov kimi şöləlendin sönmədin,
Anan dedi: - Qayıt oğul dönmədin,
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

Qarabağım səni itki sanırmı?
Dost-tanışın bir an səni anırmı?
Heç nadanlar gör dərdimi qanırmı?
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

Qardaş deyin bacı yanar odlanar,
Sinəmdə bir ürək deyil, od yanar.
Dərd əlindən şax qamətim qatlanar,
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

Həsrətinlə dərdli-dərdli gəzərəm,
Qəm gölündə dalğınlıqla üzərəm.
Məzarını gül-çiçəklə bəzərəm,
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

Sənubərəm, qardaş deyib ağlaram,
Ah-naləmlə daş ürəklər dağlaram.
Əbədilik qara yaylıq bağlaram,
Yanar qəlbim, mənim bəxtsiz şəhidim.
Unudulmaz sən tək şahbaz igidim.

## QARDAŞ İTİRMİŞƏM MƏNƏ TOXUNMA

Dərd ürəyə, ürək dərdlərə həyan,
Üzümə güzgü tut, içimə boylan.
Bir qızın gözünü yollarda qoyan,
Qardaş itirmişəm mənə toxunma.

Yannam gecə-gündüz Yasif odunda,
Uçaydım Yüzasif kaş qanadında!
Cənnət göyərçini Qiyas adında,
Qardaş itirmişəm mənə toxunma.

Tanrı göydən yerə daş tökəcəkdi,
Edib baharımı qış tökəcəkdi.
Gözlərim ağlayıb yaş tökəcəkdi,
Qardaş itirmişəm mənə toxunma.

Damarımdan axan qan ayrılıbdı,
Ömrümdən ən xoşbəxt an ayrılıbdı.
Canımdan əzizim, can ayrılıbdı,
Qardaş itirmişəm mənə toxunma.

Sənubərəm, şirin yoxsa acıyam,
Üç igidin tez ağaran saçıyam.
Üç qardaş dərdini çəkən bacıyam,
Qardaş itirmişəm mənə toxunma.

***22 avqust 1993-cü il.***

## YASİFİN AD GÜNÜNƏ

Ad gününü gözü yaşlı keçirdik,
Dost-tanışa qəm şərbəti içirdik.
Səni axtarırdıq, səni itirdik,
Gözlərim gözünə həsrət qardaşım,
O gülər üzünə həsrət qardaşım.

Anam acı ağılarla oxşadı,
Atam qəmli təsəlliylə toxtadı.
Bacıların oğrun-oğrun ağladı,
Gözlərim gözünə həsrət qardaşım,
O gülər üzünə həsrət qardaşım.

Sən mənim gülümsər gözlərim idin,
Söylənmiş şəkərtək sözlərim idin.
Sənin həsrətinə dözməli idim,
Gözlərim gözünə həsrət qardaşım,
O gülər üzünə həsrət qardaşım.

Şəhid ruhun göylərimdə uçurdu,
Günəş kimi aləmə nur saçırdı.
Nişanlını başqa oğlan qaçırdı,
Gözlərim gözünə həsrət qardaşım,
O gülər üzünə həsrət qardaşım.

Sən mənim döyünən ürəyim idin,
Kövrək arzularım, diləyim idin.
Dar gündə qardaştək gərəyim idin,
Gözlərim gözünə həsrət qardaşım,
O gülər üzünə həsrət qardaşım.

**Xasay Zeynalov**
***(1927-2011)***

## BU QARA TORPAQ

***Qarabağ uğrunda gedən döyüşlərdə şəhid olmuş dayım oğlu Yasif Fəzi oğlu Kərimovun əziz xatirəsinə***

Uddu Yasif kimi neçə cavanı
Nə doydu, nə bezdi bu qara torpaq.
O Rüstəmi-Zalı da çəkdi qoynuna,
Dedi yenə azdı bu qara torpaq.

Neçə Süleymana qurubdu tələ,
Cəmşidi, Salsalı demirəm hələ,
Divlərin nərəsi saldı vəlvələ
Onlara da dözdü bu qara torpaq.

Dünyada hökm etdi Kirlər, Daralar,
Daha fikir edib, geymə qaralar.
Çoxuna vuracaq dərin yaralar
Qüdrətlidi, sazdı bu qara torpaq.

Qəm yemə, qəm çəkmə, a Fəzi dayı,
Fələyin əliylə quruldu yayı.
Əcəl gəldi, oldu torpağın payı,
Əzəldən acgözdü bu qara torpaq.

Fələk qoymur kamım alam, yarıyam,
Dərdi-kədərinə inan yarıyam.
Xasay deyər, qəm, qüssənin yarıyam,
Əli əldən üzdü bu qara torpaq.

***1994-cü il***

# AĞLAMA, AĞLAMA, ŞƏHİD ANASI

Saç yolub, üz cırıb, saxlama yası
Ağlama, ağlama, şəhid anası.
Geyinib əyninə qara libası
Ağlama, ağlama, şəhid anası.

Müqəddəs torpağa üz qoyub oğlun,
Vətən savaşında iz qoyub oğlun,
Bilirəm sinənə köz qoyub oğlun,
Ağlama, ağlama, şəhid anası.

Vətən hamınındı aranlı, dağlı,
Oğul böyütmüsən torpağa bağlı.
Çoxdur sənin kimi sinəsi dağlı,
Ağlama, ağlama, şəhid anası.

Doğma vətən üçün gərək yanasan,
Vətəni hər şeydən üstün sanasan.
Vətən də anadır, sən də anasan,
Ağlama, ağlama, şəhid anası.

Ər oğlun göstərdi sədaqətini,
Qazandı bu xalqın məhəbbətini,
Eşit ahılların nəsihətini,
Ağlama, ağlama, şəhid anası.

İnşallah, ədalət zəfər çalacaq,
Ərənlər düşməndən qisas alacaq.
Şəhidlərin ruhu rahat olacaq,
Ağlama, ağlama, şəhid anası.

Başını dik saxla, əyilmə, çökmə,
Allaha xoş getməz, göz yaşı tökmə.
Xasayam, qəlbimə dağları çəkmə,
Ağlama, ağlama, şəhid anası.

## VƏTƏN VURĞUNU

***(poema)***

*Qarabağ müharibəsində, Vətən uğrunda şəhid olan Bərdə rayonunun Yeni Daşkənd kəndinin sakini Kərimov Yasif Fəzi oğluna həsr olunur.*

***Atalar deyibdi, bir misal da var,***
***Nəvələr həmişə babaya oxşar.***

Bərdə rayonunda qədim bir eldə,
Min doqquz yüz yetmiş üçüncü ildə.

Bir arzu göyərdi ürəkdə, dildə,
Nəcib ailədə, o ağır eldə.

Bir oğlan göz açdı, dünyaya gəldi,
Ailə şad oldu, qəlbi dincəldi.

Körpəyə qoyuldu bir şərəfli ad,
Yasif adlandırdı həm yaxın, həm yad.

Böyüdü, bu oğlan gül kimi açdı,
Qəlbinə, üzünə şəfəqlər saçdı.

Deyirlər nəvələr babaya oxşar,
Bütün el edərdi ona etibar.

Nəsli-nəcabəti igid olubdu,
Dar gündə elinə həyan durubdu.

Gənclikdə varıydı mətanət, vüqar,
“İgidin hünəri darda sınanar.”

Vətənə, elinə məhəbbət vardı,
Məharət, sədaqət, şücaət vardı.

Axı, o Bərdədə açıb gözünü,
Deyərdi mərdanə, açıq sözünü.

Qohumlar, qonşular olardılar şad,
Hamı göstərərdi ona etimad.

Qohumla, dostlarla bir yığıncaqda,
Xalçalar bəzəmiş doğma ocaqda.

Qarabağ davası söhbəti düşdü,
Məclisdə araya bir sükut çökdü.

Ayağa qalxaraq Yasif dilləndi,
Onun sözləriylə məclis güllləndi.

Eşitmişəm mən də bir hekayəti,
Atasına baxıb, etdi söhbəti:

– “Deyrilər Göyçədə qaçqınlıq olub,
Babalar qaçaraq didərgin olub.

Deyirlər, babam da davada olub,
Göyçə mahalına o, həyan olub.

Ay ata, bir danış o hekayəti,
Məşədi Qasımdan eylə söhbəti.”

Fəzi kişi dedi, səlis bir dildə,
Tarixdən söylədi, təsbehi əldə:

– Göyçə dediyiniz gözəl mahaldı,
Dağları, düzləri yaşıldı aldı.

A bala, əslimiz olub Göyçəli,
Babalar qoyubdu orda təməli.

Hər tərəfi dağdı, düzdü, dərəydi,
İnsana zövq verən bir mənzərəydi.

Ortada yerləşir Göyçənin gölü,
Min dərdə dərmandı çiçəyi, gülü.

Oğlum, bu əsrdə azı dörd dəfə,
Yağılar alıbdı onu hədəfə.

Min doqquz yüz on doqquzuncu ildə,
O tarixi kəsə deyirəm dildə.

“Hay”lar Göyçəmizə hücum eylədi,
O mahalı tamam, talan eylədi.

Babanın döşündə qoşa patrondaş,
İdrisi, Ziyadı etmişdi yoldaş.

O, elləri xilas edə bildilər,
Göyçəlilər sevindilər, güldülər.

El yığışıb yenə məsləhət etdi,
Baban Sultan bəyin yanına getdi.

Əhvalatı Sultan bəyə söylədi,
Sultan bəy də onu sərdar eylədi.

O, öz dəstəsiylə hücuma keçdi,
Düşmənin səfini dağıtdı, biçdi.

Onlar Qarabağı eylədi azad,
Dillərdə dolaşdı iki gözəl ad.

Dünyada qaydadı, ömür yetişdi,
Baban dünyasını orda dəyişdi.

Bax, bunları görüb atanın özü,
Soruşdun, söylədim, qısaca sözü."

Yasif yenə bir söz dedi ürəkdən,
Söz açdı qəlbindən keçən diləkdən:

– "Ata, deyirlər ki, olubsan topçu,
Qarşında diz çöküb çox quldur, qoçu.

Mən də sənin kimi topçu olacam,
Yağıdan qisası özüm alacam.

Qarabağ yağıdan qoy azad olsun,
Babamın orada ruhu şad olsun.

Ata, mən könüllü əsgər gedəcəm,
Özüm billəm orda nələr edəcəm.

Babamın məzarı tapdaq olmasın,
Ruhu rahat olsun, qəmə dalmasın.

Səhəri gün özü rayona getdi,
Cəbhəyə getməyi tamam həll etdi.

Gün keçdi, məsələ tamam açıldı,
Günəşin şəfəqi yerə saçıldı.

Ziyafət düzəldi məclis quruldu,
Yasifin qəlbi də onda duruldu.

Dilqəm də, Azər də qalxdı ayağa,
Hazırlıq görüldü yola salmağa.

Qohumlar, həm dostlar məclisə gəldi,
Çox saylı, bir böyük məclis düzəldi.

Masalar bəzəndi, üstü güllləndi,
Cəlil kişi qalxıb, birdən dilləndi:

– "Bu məclisə yaxşı bir aşıq gərək,
Göyçəli Hacını gedək gətirək."

Oxucu bezməsin deyim kəsəsi,
Göylərə zilləndi Hacının səsi.

Aşıq Hacı sazla məclisə gəldi,
Həqiqətən onun ləfzi gözəldi.

Məclis, masabəyi Sabiri seçdi.
O, badə götürüb mətləbə keçdi:

– "Yasifi cəbhəyə yola salırıq,
Onun mərdliyindən ilham alırıq.

Gəlin hamılıqla yaxşı yol deyək,
Hər an cəbhələrdə zəfər diləyək."

Səməd də, ay aşıq; – bir oxu dedi,
Sazını düzəltdi görün nə dedi:

***Var olsun Qarabağ, əcəb səfadı,***
***Başa Xaçın axar, ayağa – Qarqar.***
***Göyçə qar əlindən zara gəlibdi,***
***Muğan həsrət çəkər: a yağa qar, qar...***

***Ahən gəzər, səngə verər mər dana,***
***Mərd oğulun qəhrin çəkər mərd ana.***
***Mərd igid meydanda durar mərdana,***
***Müxənnət yapışar ayağa, qarqar.***

***Ələsgəri, çəkməyinən ala sən,***
***Geyinibsən, yar, qəddinə ala sən.***
***Lazımdı ki, qərib könlün alasan,***
***İncidərsən, sana, ay ağa, qarqar.***

Novruz dedi: – Hacı bir azca dayan,
Çoxdu Yasif kimi Vətəni duyan.

Qarabağ yurdumuzun gözüdü,
Yasifin qəlbində onun közüdü.

O, qələbə çalıb geri dönəcək,
Elimiz sevinib, üzü güləcək.

Hamı bir ağızdan dedi: – Ay aşıq,
Bu məclisə verdin şuxluq, yaraşıq.

İndiki başladın sən Ələsgərdən,
Birini de, bizim qədim Göyçədən.

Hacı dilləndirdi sədəfli sazı,
"Göyçəgülü" ilə gəldi avazı:

***Günəşli, gündüzlü bizim Göyçənin,***
***Gözəl yaylaqları, seyrangahı var.***
***Dörd tərəfi qatar-qatar dağlardı,***
***Ortasında qəşəng düzəngahı var.***

***Şahi-Mərdan ora nəzər salıbdı,***
***Zülfüqarı kafir üstə çalıbdı,***
***Daşda ayağının izi qalıbdı,***
***Neçə yerdə onun nişangahı var.***

***Cənnətə bənzəyir sanki qucağı,***
***Oradı dünyanın nadir bucağı.***
***Seyid Bayram, Miskin, Şişin ocağı,***
***Şəfalı, sınaqlı səcdəgahı var.***

***Qonaqsevər, qəlbi incə elləri,***
***Hatəm kimi səxavətli əlləri,***
***Əlvan-əlvan ətir saçan gülləri,***
***Ləçəkli, çiçəkli çəməngahı var.***

***Göyçənin gölündən baxsan yuxarı,***
***Bulaqların şırıl-şırıl axarı,***
***Gözəl mənzərədi Daşkənd baxarı,***
***Xasayın orada qibləgahı var.***

Masabəyi dedi: – "Gözəl oxudun,
Sanki ürəklərə çələng toxudun."

Mehdi də dilləndi: – Oxu, ay aşıq
Sözündən qəlbimiz alsın nur, işıq.

***Gün kimi aləmi tutubdu adı,***
***İgidlər sultanı, xanı Dəli Alı.***
***Pirim – Şahi-Mərdan verib muradı,***
***Artırıb şövkəti, şanı Dəli Alı***

***Namərdlər əlindən çəkirlər haşa,***
***Namuslu igidsən, səni yüz yaşa!***
***Tüfəngin gülləsi işləyir daşa,***
***Tək qaytarır yüz düşmanı Dəli Alı.***

***Ələsgərin toy işi var əlində,***
***İşi təhər tapıb Göyçə elində.***
***Sənin kimi mərd igidin yolunda***
***Qurbandı aşığın canı, Dəli Alı.***

Həkim Məzahim də gələrək dilə –
Dedi: – Fəzi dayı, bir şeir söylə.

Fəzi: – “Ağkilsəli Nəcəfə bir söz
Demişdim, deyirəm, gözəldi o söz.”

***Vəfalı dostların sözü, naməsi,***
***Mənə qiymətlidi ləl əvəzində.***
***Uzaqdı aramız, görə bilmirəm,***
***Qoy kağız danışsın dil əvəzində.***

***Sevib, xoşlayıram kəlmələrini,***
***Hər bir naxışını, ilmələrini,***
***Qoy sinəm üstünə qədəmlərini,***
***Bir şux yeriş eylə, yol əvəzində.***

***Ustadtək salmaynan Fəzini üzə,***
***Hələ çox möhtacam hikmətli sözə,***
***Sazınnan, sözünnən qonaq gəl bizə,***
***İltimas edirəm el əvəzində.***

Sabir dedi: – “Aşıq ləzzət alırıq,
Yasifi cəbhəyə yola salırıq”.

Ürəkləri Aşıq Hacı oxudu,
Zilə çəkib “Şərili”də oxudu.

***Gedirsən, qardaşım, sənə yaxşı yol,***
***Yolunda nə çovğun, nə də qar olsun.***
***Hara, hansı səmtə qədəmləsən də,***
***Qadiri-Mövlamız sənə yar olsun.***

***Yadımızdan çıxmaz şirin söhbətin,***
***Könlümdə yeri var saf məhəbbətin.***
***Hörmətin, izzətin, şanın, şöhrətin,***
***El-oba içində bərqərar olsun.***

***Dərindən dərk eylə fani dünyanı,***
***Sənə kömək olsun Kərəmin kanı.***
***Ara, axtar, seylə dostunu tanı,***
***Xasayam, arada etibar olsun.***

Sağ ol Aşıq – deyib, alqışladılar,
Vətənə qələbə arzuladılar.

Bu sözlər Yasifin üzün güldürdü,
O öz arzusunu belə bildirdi: –

– “Ata, arzumdu tez cəbhəyə gedim,
Vətəni yağıdan mən azad edim.”

Bu söz atasının qəlbindən oldu,
Qohumlar sevindi, ana şad oldu.

Məclis gözəlləndi, masa güllləndi,
Atası şəst ilə baxıb dilləndi.

– “Vətəni qorumaq şandı, şərəfdi,
Get, ay oğlum, get, haqq bizim tərəfdi.

Şücaət göstərib, gözəl ad qazan,
Çiçəyə bürünsün qoy Azərbaycan”.

Gülü ana baxıb, verirdi diqqət,
Qəlbindən gələni dedi, həqiqət.

– “Get, oğul, get, xaliq sənə yar olsun,
Sənə verdiyim süd halalın olsun.

Düşmənin yuvası tarimar olsun,
Həyatda qisməti ahu-zar olsun.”

Sabir müəllimin badə əlində,
Qəlbindən keçəni dedi dilində:

– “Bilin Yasif istədiyin edəcək,
Hər an ön sırada özü gedəcək.

Halal olsun belə kamil cavana,
Axı süd veribdi, ona mərd ana.

Səngərdə duracaq mərdi-mərdana,
Yaxşı yol, söyləyək belə cavana”.

Məclis əhli gözəl arzu dilədi,
Kəndimizdə qayda-qanun belədi.

Məclisə baxaraq Azər dilləndi
Arifdi, sərrafdı, dərin biləndi:

– “Var olsun elimiz, camaatımız,
Azad olsun gözəl Qarabağımız.

Vətənin ordusu qələbə çalsın,
Yeni Daşkəndlilər qisasın alsın.

İgidlər qayıtsın öz evlərinə,
Şadlıq məclisləri quraq biz yenə.”

Hərbi idarəyə gedəndə Yasif,
Komissarla söhbət edəndə Yasif;

“Vətən sağ gözümdü”, – deyib,
“Sərt qışı, yazımdı”, – deyib.

Polkovniklər olub şad,
Ona göstəriblər böyük etimad.

Deyiblər, bu oğlan qoçaqdı, qoçaq,
Cəbhədə hər zaman zəfər çalacaq.

Yasif cəsarətlə cəbhəyə getdi,
Ağdərə döyüşü, səngərə yetdi.

Baxın Yasif uca dağları aşır,
Qəhrəmanlıq düzü ona yaraşır.

Onunla oxuyan bütün şagirdlər,
Könüllü cəbhəyə yola düşdülər.

Onların hər biri igiddi, mərddi,
“Bərdə batalyonu” gör nələr etdi.

Öndə Yasif, Qulam, bir də Ziyafət,
Vətən torpağından alırdı qüvvət.

Tarixə yazıldı neçə-neçə ad,
Unutmaz onları nə yaxın, nə yad.

Yasif səngərə gərərək sinə,
Məğrur dayanaraq dillənir yenə:

– “Qardaşlar, çox mətin durun!
Topları birbaşa hədəfə vurun.

Düşmənin içinə vəlvələ salaq,
Qarabağımızı yağıdan alaq.

Vətənin uğrunda qazanaq bir ad,
Unutmasın bizi nə yaxın, nə yad.

Alay komandiri süzüb dilləndi,
Görün polkovnikin dediyi nədi?

– “Halal olsun sənə Bərdə balası,
Sənsən yurdumuzun arxa, xilası.”

Yasif bir az gedib birdən dayandı.
Dedi: – “Sayın görək neçə tank yandı.”

Düşməni izlədi, fikirə daldı,
Sanki İsrafildən dərsini aldı.

Qafur Məmmədovu yadına saldı,
Şücaət göstərdi, eldə ucaldı.

Yağılar əlindən çəkdi aman dad,
Qaçıb qurtarmağa axtardı imdad.

...Qulam Qədirov da o yan tərəfdən,
Ziyafət Balıyev düzgün hədəfdən.

Atdığı güllələr hədəfə dəyir,
Düşmən qorxusundan əsir, titrəyir.

BMP, BTR, PK avtomat,
Atır güllələri, düşmən olub mat.

Yasifin yanında igidlər vardı,
Onların məkanı qarlı dağlardı.

Sağdan Qulam xeyli zərbə vururdu,
Solda da Ziyafət hey vuruşurdu.

Qulamın əlində qrantamyotu,
Dedi: – "Ziyafətə al plamyotu.

Ağdərədən keçək o Çıldırana,
Düşmənlər qalsınlar qoy yana-yana.

Azad edək Sərsəng stansiyasın,
Günəş bu yerlərə salsın ziyasın."

Yasif söylədi ki, – Bir arzum da var,
Yağıları qovaq edək tarimar.

Eşitmişəm gözəl bir diyar da var,
Orada yaşayıb ata-babalar.

Hər tərəfi güllü, gözəl diyardı,
Adı Göyçə, ətraf yaşıl dağlardı.

Gedib Ağdərəni azad edərik,
Oradan Göyçəyə keçib gedərik.

Göyçəni yağıdan təmiz alarıq,
Baba diyarında rahatlanarıq.

Orada da çoxlu, igid olubdu,
Elə, obasına həyan olubdu.

Ələsgərlə Nəcəf sazı çalıbdı,
Məmmədhüseyn ordan ilham alıbdı.

Səməd ağa olub Hatəm sayağı,
Qanlı kənddən təbib o Hacı Nağı.

Daşkənddə Nağı bəy, Alıyev Vəli,
Nərimanlıda da Qlava Balı.

Məşədi Qasımdı dillər əzbəri,
Əzizli Cəmilin varmış hünəri.

Toxlucada Topal Orucla Cığal,
Ardanışda Məşəd Hümbət, Gülcamal.

Güllübulaq kənddən o Böyük ağa,
Ağqala kəndində Mir Məcid ağa.

Qulam dedi: – “Vurun! Qələbə çalaq,
Yasifin dediyi arzuya çataq”.

İgidlər vuruşa-vuruşa getdi,
Drambon kəndinə gəlib yetişdi.

Marquşevandan Drambona qədər,
Yağıdan torpağı azad etdilər.

Qulam: – “Yasif, heç də darıxma dedi,
Tezliklə Göyçəyə çatarıq dedi.

Kəlbəcərdən yalı aşıb gedərik,
Dağlarda babanın izin görərik.”

Min doqquz yüz doxsan ikinci ildə,
Avqust ayının iyirmi ikisində.

Qəzanın qədəri qəddini əydi,
Namərdin gülləsi Yasifə dəydi.

Yer də, Göy də Yasif deyib ağladı,
Yoldaşın, sirdaşın qəlbin dağladı.

Yasif Fəzi oğlu şəhid olanda,
Qulam Əkbər oğlu gözü dolanda.

Yasifin qanını alacam, – deyib,
Bu qisası yerdə qoymaram, – deyib.

Yasifin arzusu qəlbində qaldı,
Qulam yağılardan qisası aldı.

Nəhayət, vətənin şəhidi oldu,
Ağdərə torpağı şahidi oldu.

Şaxtada, boranda səngərdə qaldı,
Düşmənin canına atəşi saldı.

Yasif son nəfəsdə söylədi – "Vətən",
Vətənin qədrini bilməz hər yetən.

O, idi həqiqət Vətən vurğunu,
Hesaba almırdı şaxta, çovğunu.

Tarixdə qazandı bir şərəfli ad,
Bu gün odlar yurdu onu edir yad.

***

Yeni Daşkənddə var bir orta məktəb,
Onun şagirdləri etdilər tələb.

Gərək məktəb Yasif adına olsun,
Odlar diyarında adı car olsun.

Kəndin camaatı qərara aldı,
O məktəb Yasifin adını aldı.

Yasifin zəhməti getmədi hədər,
Hörmətlə yad edir onu şagirdlər.

Əvvəlcə Yasifin adını yazır,
Deyirlər cəbhəyə hazırıq, hazır.

Cəbhədə göstərib Yasif hünəri,
Ona görə olub dillər əzbəri.

Hələ də cəbhədən gəlməyib Yasif,
İnanın yaşayır, ölməyib Yasif.

Neçə ki, dünya var, yaşayacaq o,
Milyonlar qəlbində yaşayacaq o.

Tarixdə qazandı şərəfli bir ad,
Unutmaz nə Vətən, nə yaxın, nə yad.

Onun şücaəti yaddaşda qaldı,
Zeynalov Xasay da qələmə aldı.

## İKİ MƏŞƏDİ QASIM

Dastanımı Dəli Alı yurdunun indiki günləri ilə əlaqələndirmək fikrinə düşdüm.

Dəli Alı törəmələrinin və həmyerlilərinin erməni faşizminə qarşı aparılan Qarabağ müharibəsində igidliklə, qəhrəmanlıqla döyüşdüklərini, fərqləndiklərini eşitmişdim, bilirdim, görmüşdüm. Bilirdim ki, bu mahalın erməni cənginə keçməməsi üçün Azərbaycanın çox yerlərindən igidlər, qəhrəmanlar da döyüşmüşlər, canlarını qoymuşlar.

Belə qəhrəmanların sorağında ikən bu mahalın ərən balası VƏSİMƏ İSMAYILQIZININ «GORANBOY» ensiklopedik toplusu əlimə keçdi. Baxdım ki, Vəsimə bala bu torpaq uğrunda gedən müharibədə şəhid olanlar, əlil olanlar və itkin düşənlər haqqında çox əhatəli məlumat vermişdir (təkzibolunmaz dəlillər, geniş və bədiiləşmiş hadisələr hər bir oxucunu qane eləyə bilər).

Şəhidlər arasında bu ərazi uğrunda vuruşub şəhid olmuş iki nəfəri aradım, tapa bilmədim. Çox təəssüflənmədim, heyrətlənmədim, Vəsimə xanımı qınamadım. Axı o, deyir: «...Bu kitab goranboylulara hörmət və Goranboy torpağına məhəbbətdən yarandı. Ola bilsin ki, unudulan, əlimiz çatmayan, məlumatımız olmayan layiqli insanlar və Goranboyun tarixi ilə bağlı müəyyən faktlar, hadisələr kitabda öz əksini tapmasın… Əziz oxucum! Sizə səbr, mümkün ola biləcək qüsurlarım üçün üzr diləyirəm».

Bu iki şəhid haqda qısa məlumat verməyi özümə borc bildim.

Mən bununla həm təskinlik tapıram, həm də Dədə Ələsgərin üz tutduğu, ürəyində söz dediyi, bir ağır məclisdə tərifini verəcəyinə söz verdiyi, lakin bu vədi elə ürəyində qalan Dədə Ələsgərin həm də Məşədi Qasımın erməni

imansızlıqlarına qarşı qəhrəmanlıqla döyüşlər aparmış, şəhid olmuş Məşədi Qasımın, eləcə də Qarabağ müharibəsində – Azərbaycan torpağının bir parçası olan Goranboy ərazisinin qorunmasında igidliklə, qəhrəmanlıqla vuruşub şəhid olmuş iki Məşədi Qasım nəvəsi ilə – Qasımov Abbas Talıb oğlu və Kərimov Yasif Fəzi oğlu ilə fəxr eyləyən, hətta oğlu Yasifin şücaətindən vəcdə gəlib qurban kəsən, – “Oğlum dədəmin əvəzi oluf, neçə-neçə erməni alçağını məhv eyləyif”, – deyən Fəzi kişinin – şair Fəzi Qəmginin ruhunu şad eləmiş oldum…

Hər iki şəhid haqqında müfəssəl məlumatı Məşədi Qasımlardan olan Zakir Qəzənfər oğlu verdi:

– Ailəsilə birlikdə ulu Göyçənin Daşkəndindən qovulmuş Abbas erməni faşistlərindən bərk yanıqlı idi. Səfərəliyevdə məskunlaşmışdı – atası Talıb kişi ailəsilə. Ermənilər də bu torpaqdlara göz tikmişdilər. Goranboy eli – Dəli Alı diyarı ayağa qalxmışdı. Abbas da könüllülər batalyonuna yazıldı, silah götürüb döyüş cəbhəsinə getdi. Şəfəq kəndində qarşılaşdı yağılarla. Kəndin igidləri ölüm-dirim döyüşündəydilər. Qarayanız şivərək oğlan bərk vuruşurdu.

Qəfildən Kəpəzdən bəri bir vertalyot şığıdı, camaat qorxuya düşdü, oğlan xeyli qabağa qaçdı, bir qayanın dalını səngər elədi. Vertalyot yaxınlaşırdı, yerə snayper gülləsi ələyirdi. Birdən tüstü vertalyotu bürüdü, atəş kəsildi, camaatın soluğu genəldi. Vertalyot tüstülənə-tüstülənə Erkək kəndinin yanında gözdən itdi. Bəlli oldu ki, vertalyotu vuran kəndin igid balası Fərman Telmanoğludur. Adamlar onu dövrəyə aldılar, qucaqlayıb bağrına basanların çoxu sevindiyindən ağlayırdı. Bu vəziyyəti seyr eləyən Abbas fərəhlənir, fəxr eləyirdi.

Səhəri gün Abbas Fərmanla çiyin-çiyinə vuruşurdu… Döyüş ara vermişdi, tanış oldular. Fərman onun zülümlə

yer-yurdundan didərgin edildiyinə təəssüf elədi, ürək-dirək verdi:

– Nənəm bu bayatını tez-tez çəkirdi, Abbas:

Ağlama, naçar, ağlama,
Gün gələr keçər, ağlama!
Qapını bağlayan kişi
Bir gün açar, ağlama!

Mən elə bilirəm ki, bu özbaşınalıq çox keçməz, bu dığaları tezliklə ram eləyərik, siz də öz yerinizə, yurdunuza qayıdarsınız!

Abbas razılığını bildirdi, dedi:

– Var olsun Azərbaycanın sənin kimi qəhrəmannarı! Dünənki iyiddiyin heç kimin yadından çıxmır. Axşam danışırdılar ki, bu yağıların bir sursat maşınını, bir topunu da sıradan çıxarıbsan…

Abbasın sözü yarımçıq qaldı. Mənəş tərəfdən top atəşləri başladı. Fərman dərhal o tərəfə irəlilədi. Abbas onu tək buraxmadı. İki saatdan sonra onlar topu görürdülər. Fərman Abbasa dedi:

– Sən burda dayan, məni gözlə. İzlə məni, lazım olsa, köməyə gələrsən.

Abbas əməl elədi. Fərman irəli süründü. Çox keçmədi ki, topun səsi kəsildi. Amma onu ermənilər atəşə tutdular. Fərman ona tərəf sürünürdü, birdən arxası üstə dönüb qaldığını gördü, özünü yetirdi, bərk yaralanmışdı Fərman. Onu kəndə tərəf çəkdi. Düşmən gülləleri yağış kimi yağırdı, Allah kömək oldu, başqaları da köməyə gəldi, Fərmanı xilas elədilər, amma əcəlin əlindən ala bilmədilər. Bu gün Abbasın yaddaşına ən ağır gün kimi həkk oldu – Novruz bayramından bir həftə sonra 28 mart 1992-ci il…

Abbas and içdi, bundan sonra Fərmanın da əvəzinə vuruşdu. Neçə Goranboy iyidi, Dəli Alının qeyrətinin, qüdrətinin davamçısı ilə arxa-arxaya verib yağıları Gülüstandan o tərəfə keçirdilər. Amma döyüşlərin birində o da şəhid oldu, onu Səfərəliyevə gətirdilər, təzə qəbristanlıqda torpağa tapşırdılar. Hamı məzarıstanlıqdan getdi, əmisi oğlu Yasif qaldı, məzarın başında and içdi ki, sənin qanını yağılardan alacağam! «Yeni Samux» qəzetinin 22 iyul 1992-ci il tarixli nömrəsində deyilir: «Gülüstanın alınmasında, Ağdərənin Talış, Qırmızıkənd, Maqadis kəndlərində və rayonun mərkəzinədək gedən döyüşlərdə Abbas hamıdan irəlidə gedirdi…»

Abbasın üçü günü Yasif Ağdərə ətrafında gedən döyüşlərdə vuruşurdu. Beş gün keçmişdi, o Abbasın qanını üç dəfə almışdı, indi sərbəstləşmiş, fəallaşmışdı. Cəbhədə olduğunun ikinci ayında adı qəzetlərdə hallandı, yoldaşlarının arasında gəzdi, atası Fəzi kişini sevindirdi.

1992-ci ilin avqustunda Yasif Ağdərə vuruşlarında adlı döyüşçülərdən biri kimi jurnalist Tatyana Çaladzenin fotoaparatına düşdü, ondan tərif aldı, fərəhləndi. Tatyana Çaladze dedi:

– Mən sənin adını Yasif – Koroğlu qoyuram. Sağlıq olsun, mənim bu Qarabağ müharibəsinə həsr elədiyim albomda sən xalqına bu adla təqdim ediləcəksən…

Yasif bunun nə demək olduğunu yoldaşlarından öyrəndi. Koroğlu Rəhimovun igidliyi haqqında eşitdikləri tamamlandı. Amma Yasif Tatyana xanımın albomunu, ordakı Yasif – Koroğlunu görə bilmədi, avqust ayında şəhid oldu, onun cənazəsini yoldaşları gətirdilər – Yeni Daşkəndə.

Oğlunun cənazəsinin gətirildiyini Fəzi kişi dünəndən eşitmiş, heç kəsə söz demədən hazırlığını görmüşdü. Cənazəni qapıya çatdırmışdılar əsgərlər. El yığılmışdı. Arvad-

uşaq bir-birinə qarışmışdı. Yasifin bacıları, xalası, bibisi qızları huy çəkib şivən qoparmışdılar, anasının halı bəd idi. Fəzi kişi tələsik damdan qoçu çıxartdı, Mehdi müəllimi çağırdı:

– Ayə, ay Meyti, mana köməy elə.

Mehdi müəllim heç nə başa düşməyib irəli yeridi:

– Neyləyim, Fəzi əmi?

– Tut qoçu, çək qapıya, mən ləngidəjəm tabutu. Kəsiynən qoçu tabutun qavağında, başı arala, tabut keşsin!

Mehdi müəllim yenə heç nə başa düşmədi:

– Bu nə deməhdi Fəzi əmi?

Fəzi kişi qeyzləndi, titrədi:

– Nə deyirəm əməl elə!

Mehdi müəllimə elə gəldi ki, Fəzi kişinin huşu çaşıb. Amma hələ bu 80 illik ömründə bir sözü iki olmayan Fəzi kişinin dediyinə qeyri-ixtiyari əməl eləməli oldu, qoçu qapıya çəkdi. Fəzi kişi əsgərlərin qabağını kəsdi:

– Dayanın başınıza dönüm bir hoyur! Belə qadanız mana gəlsin, dayanın. Əsgərlər tabut çiyinlərində dayandılar. Hamı donub qalmışdı.

Mehdi müəllim qoçu yıxdı. Sabiri çağırdı ki, ayaqlarını tutsun, Sabir əməl elədi. Mehdi müəllim qoçu kəsdi, iliyini vurdu, başını bədənindən ayırıb araladı. Fəzi kişi qürurnan əsgərlərə dedi:

– Hə, indi balamı keçirin qurvanın arasınnan!

Əsgərlər tabutu içəri keçirdilər. Yığılanlar bildilər ki, Fəzi kişi Yasif balasının qabağında qurban kəsdi. Amma hərə ürəyində bunu bir cür yozdu, mənalandırdı. Əksəri bu gümanda oldu ki, kişinin başına sər gəlib, elə bilir ki, oğlunun toyudu. Bəziləri də belə yozdu ki, yəqin, Yasif müharibəyə gedirəm, – deyib, Fəzi kişi razı olmayıb, indi də heyfini oğlunun cənazəsinnən alır, ürəyini soyudur…

Mehdi müəllimi qınayanlar da vardı:

– Ayə, sən neylədin belə?!

O yazıq da çiynini çəkdi, boynunu bükdü, günahkar-günahkar, yazıqlana-yazıqlana ancaq bunu deyə bildi:

– Vallah, mən də gördüm ki, kişinin huşu özündə deyil, ama axı, nejə sındıra bilərdim onun sözünü, nejə əməl eləməzdim görsətdiyinə?!

Əlüstü halva çalındı, çay qaynadıldı. Mağar dünəndən qurulmuşdu. Əsgərlərə, yığılan qonu-qonşuya yemək hazırladılar…

Fəzi kişi erkəyin ətini bişitdirdi, tapşırdı ki, ehsannan baravar surfuya qurvan əti də qoyun. Yenə lap dəli olmasın deyə əməl elədilər.

Süfrə hazır idi. Süfrəyə ehsan ilə bir yerdə qurban əti də qoyulmuşdu, heç kəs əlini çörəyə uzatmırdı. Başda mollanın yanında oturmuş Fəzi kişi ayağa qalxdı:

– Ay Fəzi kişinin yas mərasiminin iştirakçıları! Abbasın dəfninin səhəri Yasif anasınnan halallıq aldı, mənnən izin istədi:

– Dədə, izin ver gedim babamın qanını, Abbasın qanını, neçə-neçə şəhid edilmişlərimizin qanını alım yağılardan!

Fəxr elədim, fərəhləndim, sevindim, alnınnan öfdüm, izin verdim.

Yasifin dalınca anası su atdı. Mən qürurnan baxdım. Onun yerişində yerişini görmədiyim dədəmin yerişini gördüm. Yasif müharibəyə düşdüyü günnən səsi-sorağı xoş gəldi, öyüldü, sevildi. Dünənnən bilirəm ki, o, bavasının da, əmisi oğlunun da neçə-neçə günahsız şəhidin də qanını alıf!

Yasifə qurban demişdim, qurvanını kəsdirmişəm. Tavaqqa eliyirəm, bisimillah eləyin. Onun qurvanından da dadın, ehsanından da! Bilin ki:

Heç kəs bu dünyadan almadı kamı,
Könlündə intizar qaldı da getdi!
Köhlənnər oynadıb qaldıran camı
Əlinnən oxunu saldı da getdi!

Rusdamın hünəri düşdü dəfdərə,
Əli qılıncını çaldı Əntərə
Salsal Şəhrizərə, Cəmşid Xavərə
Neçə il hökmüdar oldu da getdi!

Qəmgin Fəzi, gəl ərz eylə cahana,
Çağır insannarı dinə, imana!
Dar gündə Məhəmməd gəldi gümana,
Çağıran mətləbin aldı da getdi!

Di bismillah eləyin, Məhəmməd Əleyhissalam mətləbinizi versin!

Gümana düşənlər baxdılar yoox, Fəzi kişinin ağlı üstündə, huşu başındadı, dünyanın gərdişini hamıdan yaxşı bilir. Çörək kəsdilər, həmd-sura oxudular, cəmi şəhidlərə rəhmət dilədilər…

Azərbaycan dövləti Yasifə yüksək qiymət verdi, ölümündən sonra təhsil aldığı Yeni Daşkənd orta məktəbinə onun adını verdi, məktəbin həyətində büstünün qoyulması qərara alındı…

**Əli Qurban Dastançı,**
***«Qəhrəmanlıq Mücəssəməsi»***
***(Dəli Alı Dastanı) kitabından***

# MƏŞƏDİ QASIMIN İKİ ŞƏHİD NƏTİCƏSİ

Məşədi Qasımın nəvəsi Azər Kərimovun "Azərbaycan" qəzetinin 15 oktyabr 1992-ci il tarixli sayında çap olunan "Atamla söhbət" başlıqlı məqaləsinə redaksiyanın "Əsgər sülaləsi" adlı proloqu diqqətimi cəlb etdi. Yazıda doğru olaraq qeyd edilir ki, – "Azərbaycan üçün müxtəlif dövrlərdə ailə fenomeni həmişə bütün mənəvi ictimai dəyərlərin fövqündə durub. Ötən əyyamlarda bu xarakter özünü ziyalı, fəhlə, mühəndis şəcərəsi şəklində təzahür edib. Hər şəcərə özünəməxsus keyfiyyətləri ilə fəxr edib. Bu gün ...Azərbaycan ailəsinin yeni formasının – şəhid ailəsinin yox – şəhid sülaləsinin də mövcud olduğunu görürük."

Düzdür, Rəsullular nəsli zaman-zaman müəllimləri, mühəndisləri, alimləri, rəhbər işçiləri ilə tanınıb. Lakin XX əsrin əvvəllərində və sonunda cəlb edildiyimiz məlum münaqişələr bu nəslin "Əsgər sülaləsi" olmasına da gətirib çıxartdı. 70 il müddətində sovet ordusuna xidməti saymasaq, müstəqil olduğumuz 1918-1920-ci illər və 1991-ci ildən bu günə qədər nəslin onlarla Vətən qazisi olmuş, Abbas Qasımov, Yasif Kərimov, Ziyafət Balıyev, Mehdi Məhərrəmov, Nəbi Zeynalov və Rəsul İlyasov kimi igidləri şəhid olmuşlar. İndi isə sizlərə igid el qəhrəmanı, sərrast atıcı kimi tanınan sərkərdə Məşədi Qasımın iki nəticəsi – Abbas Qasımov və Nəbi Zeynalov haqqında məlumat vermək istərdim. Abbas Qasımov Məşədi Qasımın oğlu Sayadın nəvəsi, Nəbi Zeynalov isə Məşədi Qasımın qızı Narın xanımın nəvəsidir. Qeyd edim ki, Nəbi həm də Məşədi Qasımın bacısı Bahar nənənin nəticəsidir.

**Qasımov Abbas Talıb oğlu** 1970-ci ildə Samux rayonunun Nəbiağalı qəsəbəsində doğulmuşdur.

Xanlar rayon Hərbi Komisarlığı tərəfindən 3 yanvar 1992-ci ildə Milli Orduya göndərilmiş, 701-ci hərbi hissənin avtomatçısı olmuşdur.

Abbas Qasımov könüllü olaraq Qarabağ uğrunda gedən döyüşlərə qoşulmuşdur. Yoldaşları arasında "Snayper Abbas" deyə çağırılmışdır. O, sərrast atıcı və minaları təhlükəsizləşdirən hərbçi idi. Belə bir söz var – deyirlər ki, nəvələr həmişə babaya oxşar. Abbasın babası Sayad Kərimov yaxşı atıcı olduğuna görə 1920-ci illərdə yaranmaqda olan Ağdam milis idarəsinə işə qəbul edilmişdir.

5 iyul 1992-ci ildə Abbas Qasımov Ağdərə rayonunda gedən qızğın döyüşdə ayağından yaralanmasına baxmayaraq geri çəkilməmiş, son damla qanına qədər düşmənlə üzüzə döyüşmüş və qəhrəmancasına şəhid olmuşdur. Abbas Qasımov Samux rayonunun Nəbiağalı qəsəbəsində dəfn edilmişdir. O, Samux rayonunun ilk şəhididir.

"Snayper Abbas" kimi tanınan Abbas Qasımov Gülüstanın alınmasında, Ağdərənin Talış, Qırmızıkənd, Maqadis kəndlərində gedən döyüşlərdə xüsusən fəallıq göstərmişdir.

"Yeni Samux" qəzetində[1] və "Samux şəhidləri" kitabında[2] Abbas Qasımovun həyatı və döyüş yolu haqqında geniş məlumat verilmişdir.

**Zeynalov Nəbi Surxay oğlu** 1975-ci ilin 1 fevralında Basarkeçər rayonunun Daşkənd kəndində anadan olmuşdur. 1988-ci ilin noyabrında mənfur qonşularımız olan erməni millətçilərinin siyasəti nəticəsində tarixi Azərbaycan tor-

---

[1] Amalya Qasımova, "Yollara boylanma, ana!", "Yeni Samux" qəzeti, №01(01), 22 iyul 1992-ci il.

[2] "Samux şəhidləri" (tərtib edəni:Amalya Qasımova), Bakı, "Önər", 1995.

pağı olan Göyçə mahalından ailəsi ilə birlikdə ata-baba yurdunu tərk etmiş, əvvəlcə Bərdə rayonunun Yeni Daşkənd kəndində məskunlaşmış, daha sonra isə daimi olaraq Xanlar (indiki Göygöl) rayonunun Quşçu kəndinə köçmüşlər. Nəbi sonbeşik övlad olduğundan ailənin sevimlisi idi. O, Göyçə mahalında ikən zəhmətkeş, əməksevər bir oğlan, işləməkdən yorulmayan, ata və anasına təsərrüfat işlərində yaxından kömək edən idi.

Nəbi Qarabağ müharibəsinin ən ağır günlərində – 1993-cü ildə Göygöl rayon Hərbi Komisarlığı tərəfindən hərbi xidmətə çağırılmışdır. Bir çox döyüşlərdə igidliklər göstərərək xidmət etdiyi "N" saylı hərbi hissədə zabitlər tərəfindən əsgərlərə nümunə göstərilmişdir. Onun son döyüşü 1993-cü il iyul ayının 31-də oldu. Ağdərə bölgəsində gedən döyüş əməliyyatı zamanı Nəbi Zeynalov qəhrəmancasına şəhid oldu. Xidmət etdiyi hərbi hissənin zabit və əsgərlərinin, eləcə də əzizlərinin iştirakı ilə məskunlaşdıqları Xanlar rayonunun Quşçu kəndində dəfn edildi. Allah sənə və bütün şəhidlərimizə rəhmət eləsin Nəbi!

Nəbi Zeynalovun həyatı və döyüş yolu haqqında "Sərhəd" qəzetində[1] və "Göyçə mahalında, Daşkənd elində" kitabında[2] məlumat verilmişdir. Şəhidin əmisi Xasay Zeynalov "Ay Nəbi" adlı şeirini[3] onun əziz xatirəsinə həsr etmişdir.

**Araz Yaquboğlu,**
***"Laçın yurdu" jurnalı baş redaktorunun müavini***

---

[1] Xasay Zeynalov, "Kəpəz ona lay-lay deyir", "Sərhəd" qəzeti, 27 iyul 1994-cü il.

[2] Qocaman Qocamanov, "Göyçə mahalında, Daşkənd elində", Bakı, "Nurlan", 2007. səh. 23-24

[3] Xasay Zeynalov, "Vətən həsrətində, el firqətində", Bakı, "Hərbi Nəşriyyat", 2009. səh.209-210

## AY NƏBİ

***Dağlıq Qarabağ uğrunda gedən döyüşlərdə şəhid olan qardaşım oğlu Zeynalov Nəbi Surxay oğlunun əziz xatirəsinə***

Vətən savaşında, yurd savaşında
Nişan aldı səni yağı, ay Nəbi.
Dərd üstündən dərdimizi artırdı,
Çəkdi sinəmizə dağı, ay Nəbi.

Tale tərs gətirdi, tərsinə baxdı,
Namərdlər gülləni sinənə çaxdı,
Ananın gözündən qanlı yaş axdı,
Saraldı gözünün ağı, ay Nəbi.

Yer də, göy də Nəbi deyib ağladı,
Buludlar ah çəkdi, çaylar çağladı,
Gözəl bacıların qara bağladı,
Soldurdular gül yanağı, ay Nəbi.

Təzə tamamıydı on səkkiz yaşın,
Kim idi bilmədik on dörd yoldaşın,
Qəmlərə dalıbdı atan, qardaşın,
Kəsilib qolunun sağı, ay Nəbi.

Düçar oldun zəmanənin badına,
Xasay qurban, sənin şəhid adına,
Çatammadım harayına, dadına,
Yandı ürəyimin tağı, ay Nəbi.

***

Əzizinəm dəng eylər,
Dərdin məni dəng eylər,
Elə dərdə salıbsan
Axırda bəd rəng eylər.

## KƏPƏZ ONA LAY-LAY DEYİR

Xanlar rayonunun Quşçu-Armavir kəndinin qəbirstanlığında bir şəhid uyuyur. Onun məzarına gecəli-gündüzlü Kəpəz də lay-lay çalır.

Nəbi Surxay oğlu Zeynalov 1975-ci il fevral ayının 1-də ulu Göyçənin Daşkənd kəndində dünyaya göz açmışdı.

1988-ci il noyabr ayında erməni quldurları başqa yurddaşlarımız kimi onları da minillik ata-baba torpaqlarından didərgin saldılar. Onların ailələri ölümlü-itimli yollardan keçdikdən sonra Xanlar rayonunun Quşçu-Armavir kəndinə gəlib çıxdılar. Burada torpaq sahəsi alıb yurd saldılar. Bu kənd ermənilərin bir vaxtlar “ölüm yuvası” olan Çaykəndin bir neçə kilometrliyində yerləşirdi. Çaykənd uğurundakı döyüşlər Nəbinin gözü qarşısında gedirdi. Bu qanlı savaşdan sonra sanki o birdən-birə böyüyüb kişiləşdi.

1993-cü ildə orta məktəbi qurtaran kimi rayon hərbi komisarlığına müraciət etdi. Bir neçə gündən sonra o, artıq “N” saylı hərbi hissədə xidmət etməyə başladı. Onların tabırı bir neçə ay “N” mərkəzində təlim keçdi. Gərgin keçən məşqlərdən sonra Nəbigilin tabırı Ağdərə istiqamətinə ezam olundu. İlk günlərdən ağır döyüşlərə başladılar. Torpaqlarımız addım-addım yağılardan azad edildikcə Nəbinin sevinci yerə-göyə sığmırdı. Çünki Ağdərədən keçən yolların bir qolu da ulu Göyçəyə uzanıb gedirdi.

Nəbinin son döyüşü “N” kəndi yaxınlığında oldu. 1993-cü ilin iyul ayının 31-də onların bölüyünə kəndin üstündəki strateji əhəmiyyətli yüksəkliyi düşmənlərdən almaq tapşırılmışdı. Düşmən bu yüksəkliyi bütün qüvvəsiylə müdafiə edirdi. Nəbi qorxmadan əsgər dostları ilə döyüşə atıldı. Bir neçə saat çəkən qanlı vuruşmadan sonra yüksəklik erməni quldurlarından təmizləndi. Lakin qəfil düşmən gülləsi onu əbədi olaraq susdurdu.

**Xasay Zeynalov**
***“Sərhəd” qəzeti, 27 iyul 1994-cü il.***

## YOLLARA BOYLANMA, ANA!

Kənd toylarının yaraşığıydı Abbas. Qoşanağaranın səsi aləmi başına götürəndə cavanların əl-qolu açılardı, oynayıb-oxumaq başlanardı. Onu belə şən, deyib-gülən tanıyardılar. İri qara gözləri yaşamaq eşqi ilə doluydu. Bəlkə də çoxları onun qanlı-qeyrətli oğul olduğunu gənclik şıltaqlığı arxasından sezməmişdilər hələ. Qoşanağaranı, çal-çağırlı aləmi avtomatla əvəz edəndə onun bu qətiyyəti ailəsini də çaş-baş qoymuşdu. Demə, qeyrətli bir qəlbin, bir ürəyin sahibiymiş. “Sən getmə, mən getməyim, bəs kim alsın Xocalıda qanına qəltan edilmişlərin qanını? Torpağımızın, çörəyimizin haqq-sayını itirənlərin cəzasını kim versin?”. Suallar qarşısında qoyurdu hamını. Cəbhəyə çağırışçı kimi yox, könüllü kimi getmişdi.

Xanlar rayon milli-müdafiə dəstəsində “Snayper Abbas” qoymuşdular adını. Sərrast atırdı, həmişə öndə gedib yoldaşlarını ürəkləndirirdi. Sanki minaları əli ilə düzmüşdü. Düz üstünə gedib, tapıb zərərsizləşdirirdi. Düşmənin hər hücumunu dəf edəndə vedrədən, qazandan, stol-stuldan tapıb qoşanağaraya çevirərdi. Çalırdı, zəfər nəğmələri oxuyurdu Abbas. Amma bu nəğmələrin kədər dolu anları da olurdu. Həlak olmuş əsgər yoldaşlarının hələ soyumamış cəsədi üstündə ağlaya-ağlaya çalıb marş oxuyurdu. “Qoy son nəfəsdə igid əsgər kimi canını tapşırsın. Oğul itiririk, Vətən yolunda canından keçən igid əsgər itiririk”, – deyirdi.

Hərdən istirahət günləri evə buraxılanda təsadüfən hər dəfə toy üstə çıxardı. Bir gündə cəbhənin bütün ağrı-acısını unutmaq istəyirdi. Mikrofonu alıb şən mahnılar oxuyurdu, hər dəfə də istər-istəməz axırda cəngiyə – marşa keçirdi. Amma, tale ona toy qismət etmədi. Fatma ananın, Talıb

atanın öz sonbeşiklərinə bəslədikləri xoş ümidlər yarımçıq qaldı. "Öz toyu çalınmadı, çiçəyi burnunda soldu balam" – deyə Fatma xala hələ də oğlunun bir igid kimi öldüyünə inanmır, gözləri yollardan yığılmır. Sanki dünyanın bütün yollarını yumağa çevirib yığıb gözlərinin giləsinə. Yolların o başında isə oğlu görünmür ki, görünmür. "Abbas necə ölüb ki, yurdunda cənazəsi qoyulub ağı demədi ana, yuyub el adətincə kəfənə bükmədi?" Gözü döyüş yoldaşlarının ağzında qalıb. Söylədir, söylədir, inana bilmir eşitdiklərinə. Onunla birlikdə son döyüşdə olmuş qonşusu Mürvət İsmayılov deyir ki, Goranboyun Mənəş, Buzluq, Erkəc, Başkənd kəndlərinin, Gülüstanın alınmasında, Ağdərənin Talış, Qırmızıkənd Maqadis kəndlərində və rayonun mərkəzinədək gedən döyüşlərdə Abbas hamıdan irəlidə gedirdi. Ağdərənin alınmasında yaralandı. Məni döyüş xəttindən 15 kilometr arxaya gətirdilər. O, isə ayağından yaralansa da vuruşurdu. Sonra eşitdim ki, Abbas həlak olub. Amma cəsədi bir neçə gün sonra taxıllıqdan tapıldı.

Deyilənlərə görə, yoldaşları 5 gün Abbası axtarıblar və üzüqoylu ölmüş halda tapıblar. Tamam tanınmaz olubmuş. Qolundakı saat nişanə olub, son şahid olub, nəbzinin son döyüntüsünü eşidib... Bəlkə son nəfəsdə özü üçün oxuduğu son nəğməni də.

Hər təzə özülün açılışını bayram edərlər. Amma qəbiristanın təzəsi də hüzn gətirir. Doğulub boya-başa çatdığı Nəbiağalıdakı təzə qəbiristanın ilk sakini, həm də ilk şəhid döyüşçüsü oldu Abbas. Elə döyüşçü libasında da torpağa tapşırıldı. Bütün el buraya axışmışdı. Beli bükülsə də, Talıb kişinin vüqarı sınmamışdı. Yanıb külə dönən qızlarına təsəlli üçün elə hey deyirdi: – Elin oğludur Abbas. Vətənə qurban gedib. O, indi tək bizimki deyil...

Rayonun və qəsəbənin rəhbər işçiləri, ağsaqqallar danışdılar. Təsəlli yenə Vətən oldu, onun murdar erməni qiyamçılarından azad edilməsi zərurəti oldu.

Təzə qəbiristanda yaşamaq, gözəl günlər görmək üçün doğulmuş bir gənc uyuyur. Cəmi 20 il yaşadı. 1992-ci il iyulun 5-də Vətənin azadlığı, xalqın qeyrəti, namusu yolunda fəda oldu. Ölümün zirvəsi Vətən uğrunda şəhidlikdir. Abbas Talıb oğlu Qasımov indi həmin əbədiyyət zirvəsindədir. Hərdən bir doğmalarının sitəmindən qəlbi daralıb yuxularına gəlir: "Ağlamayın, yollara boylanmayın", – deyir, – "Mən torpağın oğlu oldum. Torpaq ki, əbədidir"...

**Amalya Qasımova,**
***"Samux şəhidləri" kitabı,***
***Bakı, "Önər", 1995.***

## QASIMOV ABBAS TALIB OĞLU

Qasımov Abbas Talıb oğlu 1970-ci ildə Samux rayonunun Nəbiağalı qəsəbəsində doğulmuşdur. Azərbaycanlı. Xanlar Rayon Hərbi Komisarlığından Milli Orduya çağırılmışdır (03.01.1992). Sıravi əsgər, 701-ci hərbi hissənin avtomatçısı. Ağdərə rayonunda həlak olmuşdur (05.07.1992). Nəbiağalı qəsəbəsində dəfn edilmişdir.

***Azərbaycan Respublikası Xatirə Kitabı,***
***III cild, Q hərfi,***
***Respublika Xatirə Kitabı Redaksiyası,***
***Bakı, 2001. səh.106.***

## RƏSULLU ŞƏHİDLƏRİNDƏN ÜÇÜ

Rəsullular nəsli əsas iki – Hacı Kərim və Hacı Balı qolundan ibarətdir. Məşədi Qasımın əmisi Hacı Balının oğlanları Tahar, Məhərrəm və Mürsəlin nəvə-nəticələri olan şəhidlər Ziyafət Balıyev, Mehdi Məhərrəmov və Rəsul İlyasovun həyat yolu ilə tanış olaq.

**Balıyev Ziyafət Qurban oğlu** 7 iyul 1965-ci ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində doğulmuş, 1983-1985-ci illərdə sovet ordusu sıralarında serjant rütbəsilə hərbi xidmətdə olmuşdur. Hərbi xidmətdən sonra 1985-1990-cı illərdə Bərdə rayon 4 saylı ƏNG-da sürücü işləmişdir.

1990-cı ildə Bərdə rayon DİŞ-də polis baş serjantı kimi işə başlamışdır. 24 mart 1991-ci ildə PPX tağımının tərkibində Ağdərə döyüş bölgəsinə göndərilmiş Ziyafət Balıyev erməni işğalçılarına qarşı aparılan döyüş əməliyyatlarında qarşısında qoyulmuş tapşırıqları layiqincə yerinə yetirmiş, qəhrəmanlıqları ilə döyüşçü yoldaşlarından xüsusilə fərqlənmişdir. O, dəfələrlə erməni quldurlarının xeyli sayda canlı qüvvəsini məhv etmişdir.

Ziyafət 13 sentyabr 1992-ci ildə Ağdərə rayonunun Çıldıran kəndi uğrunda gedən döyüşdə qəhrəmancasına şəhid oldu. Subay idi.

Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin 15 yanvar 1995-ci il tarixli 262 saylı fərmanı ilə Balıyev Ziyafət Qurban oğlu ölümündən sonra “Hərbi xidmətlərə görə” medalı ilə təltif edilmişdir.

Məzarı Bərdə rayonu Yeni Daşkənd kənd qəbiristanlığındadır. Bərdə şəhərindəki mərkəzi küçələrdən biri və Yeni Daşkənd kənd mədəniyyət evi Ziyafət Balıyevin adını daşıyır.

Ziyafət Balıyevin həyatı və döyüş yolu haqqında Sərraf Şiruyənin "Od oğlu od içində" poemasında[1] daha ətraflı məlumatlar verilmişdir. "Göyçə şəhidləri", "Yaralı Göyçə" və "Azərbaycan Respublikası Xatirə Kitabı" adlı kitablarda da onun haqqında oçerklər dərc olunmuşdur.

**Məhərrəmov Mehdi Əmirxan oğlu** 26 iyun 1973-cü ildə Göyçə mahalının Daşkənd kəndində molla-şair ailəsində anadan olmuşdur.

1988-ci ildə məlum səbəblərdən ailəsi ilə birlikdə Bərdə rayonunun Yeni Daşkənd kəndində məskunlaşmışdır. Dini elmlərə yiyələnən Mehdi Məhərrəmov 1990-cı ildə Yeni Daşkənd kənd orta məktəbini bitirmişdir.

11 mart 1992-ci ildə Bərdə rayon Hərbi Komisarlığı tərəfindən hərbi xidmətə çağrılmış və Qarabağ uğrunda gedən döyüşlərin iştirakçısı olmuşdur.

Mehdi Məhərrəmov Ağdərə rayonunda gedən döyüş əməliyyatlarında 730-cu hərbi hissənin bacarıqlı rabitəçisi və avtomatçısı kimi xidmət göstərmişdir.

5 fevral 1993-cü ildə Ağdərə rayonunun Çıldıran kəndində gedən döyüşlər zamanı itkin düşmüşdür.

Bərdə rayon Xalq Məhkəməsi tərəfindən Məhərrəmov Mehdi Əmirxan oğluna şəhid adı verilmişdir.

Mehdi Məhərrəmovun həyatı və döyüş yolu haqqında "Bərdə şəhidləri", "Yaralı Göyçə", "Göyçə mahalında, Daşkənd elində"[2] və "Azərbaycan Respublikası Xatirə Kitabı"[3] adlı kitablarda ətraflı məlumatlar verilmişdir.

---

[1] Sərraf Şiruyə, "Ağlama bülbül, ağlama", Gəncə, 1994. səh.304-324 və Sərraf Şiruyə, "Seçilmiş əsərləri" II cild, Bakı, "Nurlan", 2008. səh.303-329.

[2] Qocaman Qocamanov, "Göyçə mahalında, Daşkənd elində", Bakı, "Nurlan", 2007. səh. 23.

[3] Azərbaycan Respublikası Xatirə Kitabı, IX cild, M(M...-Məmmədov L.), Respublika Xatirə Kitabı Redaksiyası, Bakı, 2009. səh.256.

**İlyasov Rəsul Niftalı oğlu** 12 iyul 1975-ci ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində anadan olmuşdur. Yeni Daşkənd kənd orta məktəbi ilə bərabər Bərdə şəhər 1 saylı Musiqi Məktəbində də təhsil almışdır. 1992-ci ildə orta məktəbi bitirmiş və 1993-cü ildə Bakı Ali Menecer Kollecinə daxil olmuşdur.

Şərqdə ilk metro kimi 1967-ci ildə «Ginnesin Rekordlar Kitabı»na düşən Bakı metropolitenində 28 oktyabr 1995-ci ildə dəhşətli partlayış baş vermişdir. Bakı metropoliteninin "Ulduz" və "Nəriman Nərimanov" metrostansiyaları arasında hərəkət edən 21 saylı qatarın 4-cü vaqonunda erməni terrorçularının yerləşdirdiyi partlayıcı qurğu işə düşmüş və bütün qatarı alov bürümüşdür. Rəsul da bu qatarda sərnişinlər arasında olmuş və sağ qalmışdır. O, özü ilə iki nəfəri də xilas edərək od-alovdan uzaqlaşır. Lakin Rəsul orada eşitdiyi ah-nalə, fəryad səslərinə laqeyd qala bilmir. Köməksiz insanların tuneldə qaldığından o ikinci dəfə Azərbaycanın Milli Qəhrəmanı Çingiz Babayevlə yenidən tunelə qayıdıb ki, yaralılara xilas olmaları üçün kömək etsinlər. Rəsul İlyasov və Çingiz Babayev qatı tüstüdən boğularaq şəhid oldular. Bu hadisədə 300 adam həlak olub, 400 nəfər isə xəsarət alıb. Həmin vaxt Prezident Heydər Əliyevin göstərişi ilə ölkədə 3 gün matəm elan olunmuşdur. Xatırladaq ki, hadisə ən dəhşətli metro qəzası kimi «Ginnesin Rekordlar Kitabı»na da düşüb.

Rəsul İlyasov Bərdə rayonunun Yeni Daşkənd kəndində dəfn olunmuşdur. Onun həyatı haqqında Səyyad Şairovun "Yaralı Göyçə" adlı kitabında[1] da məlumat verilmişdir.

**Araz Yaquboğlu,**
***"Qızıl qələm" mükafatı laureatı***

[1] Səyyad Şairov, "Yaralı Göyçə", Bakı, "Nurlan", 2006.

**Sərraf Şiruyə**
***Azərbaycan Yazıçılar Birliyinin və***
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü***
***«Qızıl Qələm», «Məmməd Araz» və***
***«H.B.Zərdabi» mükafatları laureatı***

## ŞƏHİD QƏBİRLƏRİ

Al-əlvan çiçəklər, qırmızı lentlər,
Burda bəzəyibdi cansız daşları.
Burda cərgələnib ərgən igidlər,
Yatır bu millətin qan qardaşları.

Hər məzar başdaşı bir ünvan verir,
Hər mərmər başdaşı alboma dönüb.
Baxıram, baxıram yaram qan verir,
Bir gör neçə-neçə ocaqlar sönüb.

Dağ boyda qüdrəti olan igidlər,
Necə də sığışıb bir dar məzara.
Hünəri tarixdə qalan igidlər,
Yetməyib bu günkü xoş arzulara.

Hər elin-obanın məzarıstanı,
Şəhid qəbirlərlə məbədlənibdi.
Neçə anaların ümid, gümanı,
Üz çevirib bu məbədə gəlibdi.

Bax bu da bir elin məzarıstanı,
Bu da cərgələnən igid şəhidlər.
Mən deyim onları sən bir-bir tanı,
Gör nələr söyləmir bu xatirələr.

Qayıtdı Yasifin nişan üzüyü,
Bağlı boxçadadı o vaxtdan bəri.
Bax budur, bax budur dərdin böyüyü,
O vaxtdan qurumur ana gözləri.

Şəhid cərgəsinin başında durub,
Od içində qalan polis Ziyafət.
Görən hansı qızdı boynunu burub,
Hansı bir ürəkdə susdu məhəbbət.

Aylar illər keçir, bu müşgül sual,
Bir düyünə dönüb açılmır hələ.
Bəlkə açılsaydı bu şirin xəyal,
Təsəlli olardı böyük bir elə.

Bu da çinar boylu nər Eldənizdi,
Arşın oğlu dirək soy kökündəndir.
Dağ kəlini yıxan ər Eldənizdi,
Polad ürək, bilək soy kökündəndir.

Taleyi qaralı kapitan Cəfər,
Qaldı tarixlərdə adın, hünərin.
Olmadı nə anan, nə atan Cəfər,
Can deyib ağladı səni ellərin.

Boran-qarda qalan yaralı Ziya,
Ellər söhbət açır cəsarətindən.
Cəsədi elindən aralı Ziya,
Atan da köç etdi bu firqətindən.

Ay böyük amallı «balaca» Qulam,
Neçə tanklar yıxdı qrantamyotun.
Adın çəkildikcə el deyir: - balam,
Oyanın təzədən nişangah tutun.

Bax bu da Firudin, qələm-qaş oğlan,
Vətənə canını qurban eylədi.
Döşünə sıxdığı avtomatıyla,
Düşmənin bağrını al-qan eylədi.

Bu da nur çöhrəli Elçinin qəbri,
Budur görüşünə gəlib bir gəlin.
Necə böyük imiş qəzanın cəbri,
Ayırdı sevgidən sevginin əlin.

İki məzar yeri boş qalıb burda,
Kaş güman gülləri ləçəklənəydi.
Müjdəçi gələydi bir gün bu yurda,
Hicranlı könüllər çiçəklənəydi.

İtkin Rəşadət, itkin Mehdimiz,
Qayıdıb gələydi doğma vətənə.
Tanrıya xoş gələ kaşki əhdimiz,
Şükürlər edəydik biz dönə-dönə.

Bu da Məhərrəmin bəzənmiş qəbri,
Oğul, qız əliylə bəzədilibdi.
Bu dərdə dözmədi atanın səbri,
Axirət evinə o da gəlibdi.

Bax bu da Rəsul, bu da son şəhid,
Bu da on ikinci, sayımın sonu.
Cəsus əməlləri vurdu bir kilid,
Metroda partlayış apardı onu.

Yenə bir-bir baxıb vidalaşıram,
Ziyarət edirəm bu qəbirləri.
Qəlbi dərdli-dərdli uzaqlaşıram,
Hələ gəzməliyəm neçə elləri.

Ölkədə elə bir el-oba yoxdur,
Orda şəhid qəbri olmaya Allah!
Sənin hər qüdrətin, kərəmin çoxdur,
Elə et tər güllər solmaya Allah!

***2010-cu il.***

## DÖNÜB İGİDLƏR

***Kəndimizin şəhidlərinə və itkinlərinə***

El yığılıb səcdəsinə gəlibdi,
Dinə bilmir, daşa dönüb igidlər.
Dünən sevinciydi, bu gün gözlərdə,
Qurumayan yaşa dönüb igidlər.

Bu sitəmi tarix, zaman deyəcək,
Bu hünərlə el özünü öyəcək.
Elə sanırıq ki, yenə gələcək,
Bir köçəri quşa dönüb igidlər.

Ziyafətim ildırım tək çaxardı,
Qulam baxışından alov yağardı.
Eldəniz, Məhərrəm dağlar yıxardı,
Bir xəyala, huşa dönüb igidlər.

Yasif, Firuddinə, Ziya, Mehdiyə
Ağlarıq Elçinə nər deyə-deyə.
Rəşadət hünəri yetdi mərdliyə,
Qoşa gedib, qoşa dönüb igidlər.

Yaddan çıxmayıbsız, ay Rəşid, Cəfər,
Qəzaydı siz gedən o ağır səfər.
Sərraf Şiruyəyəm, qəlbimdə qəhər,
Sanıram keçmişə dönüb igidlər.

## SİZƏ LAYLAY ÇƏKƏMMİRƏM

Qönçə-qönçə solanlarım,
Sizə laylay çəkəmmirəm.
Kəfəni qan olanlarım,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Qan qundaqlı qardaşlarım,
Həmdəmlərim, sirdaşlarım.
Ey təsəlli başdaşlarım,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Oğul gəzən gözlərə bax,
Bükülüb bel, solub dodaq,
Ey nur səpib sönən çıraq,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Bəy xonçası görməyənlər,
Sevgi saçı hörməyənlər,
Bağ becərib dərməyənlər,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Ey Yasifim, Ziyafətim,
Məhərrəmim güc-qüdrətim,
Firudinim, Rəşadətim,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Eldənizim bir pirhünər,
Qulam, Elçin ər oğlu, ər!
Mehdi, Ziya, Rəsul, Cəfər,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Üzü gülüb olmasın şən,
Nakam qoydu sizi düşmən,
Qaçqın Daşqın, Rəşad, Elşən,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

Tükənməzdi ah-ünlərim,
Yada düşüb sürgünlərim,
Qəriblərim, itkinlərim,
Sizə laylay çəkəmmirəm,
Siz yoxsunuz deyəmmirəm.

**Aqşin Hacızadə**
***Qarabağ müharibəsi veteranı, şair***

## VƏDƏSİZ

***Kəndimizin şəhidləri və itkinlərinə***

Nə sirdir, ilahi yaratdığını,
Talayır, dağıdır, çapır vədəsiz.
Tor qurur insanın ömür yoluna,
Ölüm kəməndini atır vədəsiz.

Budur məzarıstan, budur məzarlar,
Tarixdi bu şəhid, igid oğlanlar.
Bir kam almayıbdı dünyadan bunlar,
Torpağın qatına batır vədəsiz.

Ziyafət Yasiflə düşünür burda,
Ziyanın məzarı hardadı, harda?...
Rəşadət Mehdiylə qalıbdı darda,
Zaman qollarını çatır vədəsiz.

Firudin Qulamla bax, qoşa durub,
Eldəniz Elçinlə baş-başa durub.
Cəfər əcəl ilə yarışa durub,
Nakamdı, torpaqda yatır vədəsiz.

Məhərrəm olubdu dillər əzbəri,
Nə məsumdu bu ərlərin nəzəri?
Solubdu Rəsulun qönçə gülləri,
Ölüm yaxşıları tapır vədəsiz.

***24 aprel 1995-ci il.***

**Zülfiyyə Şiruyəqızı**
***Yasif Kərimov adına Yeni Daşkənd kənd tam orta məktəbinin müəllimi***

## ŞƏHİDLƏR

Vətən torpağında gül açsın deyə,
Qanını torpağa əkdi şəhidlər.
Qeyrət silahıyla silahlandılar,
Koroğlu nərəsi çəkdi şəhidlər.

Hər birisi Cavanşirə tay oldu,
Dillərində havar oldu, hay oldu.
Qanları qarışdı axar çay oldu,
Qızıl qan içində itdi şəhidlər.

Yağı zəhərini içməsin, deyə,
Düşmən bu torpağa keçməsin, deyə,
Vətəndən aralı düşməsin, deyə,
Vətənin qoynuna getdi şəhidlər.

Dedilər Vətən də anadır, ana,
Can verib, can vermək gərəkdir ona.
Bu odlar diyarı Azərbaycana,
Canlarını fəda etdi şəhidlər.

Ölümdən nə qorxub, nə oysandılar,
Vətənin oduna düşüb yandılar.
Tanklar qabağında şax dayandılar,
Vətən, vətən deyib ötdü şəhidlər.

Susdu gözü bağlı, zülmün hakimi,
Qeyrətin, qüdrətin gərildi simi,
Əbədi solmayan bir çiçək kimi,
Vətənin könlündə bitdi şəhidlər.

## RƏSULLULAR II DÜNYA MÜHARİBƏSİNDƏ

1 sentyabr 1939-cu ildə başlayan II Dünya Müharibəsinə Sovet İttifaqında yaşayan xalqlardan səfərbər edilən çağırışçılar içərisində azərbaycanlılar da az olmamışdır. Xüsusən, Ermənistanda və Gürcüstanda yaşayan əhalinin azərbaycanlılardan ibarət hissəsi müharibəyə düşünülmüş şəkildə daha çox göndərilmişdir. Bu sətirlərin müəllifi Araz Yaquboğlunun 2005-ci ildən apardığı genişmiqyaslı tədqiqatlar zamanı məlum olmuşdur ki, Göyçə mahalının Daşkənd kəndindən II Dünya Müharibəsinə 250 nəfər səfərbər olunmuş və bu çağırışçılardan təxminən yarısı, yəni 126 nəfəri itkin düşmüş, həlak olmuşdur. Qalanlardan 122 nəfər müharibə veteranı kimi doğma kəndlərinə qayıtmış, biri Amerikada (Məhərrəm Musayev), biri isə Türkiyədə (Niftalı Xəlilov) qalıb yaşamışdır. Aparılan tədqiqatın nəticəsi tərəfimizdən “Respublika Xatirə Kitabı Redaksiyası”na təqdim olunmuş və “Azərbaycan Respublikası Xatirə Kitabı” adlı ensiklopediyada (8 ədəd əlavə şəkil olmaqla) çap olunmuşdur.[1]

Bu müharibə Rəsullular nəslindən də yan keçməmiş, hətta bir çoxları bu müharibəyə könüllü olaraq getmişdir. Onlarla müharibə veteranımız var idi. Ona qədər adamımız isə bu müharibədə itkin düşdü, həlak oldu.

**Kərimov Xanlar Rəsul oğlu** 1903-cü ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. Geniş dünyagörüşü, dərin biliyi olan Xanlar Kərimov mühasib kimi Basarkeçərin bir çox kolxozlarında

[1] “Azərbaycan Respublikası Xatirə Kitabı” , XI cild, “Respublika Xatirə Kitabı Redaksiyası”. Bakı, 2011. səh.641-647.

işləmişdir. 1936-cı ildə Basarkeçər RHK-dan orduya çağırılmış, iki il hərbi xidmətdə olmuşdur. 1941-ci ilin sentyabrında Basarkeçər RHK-dan müharibəyə səfərbər olunmuşdur. Qızıl əsgər Xanlar Kərimov Primorsk ordusu 775-ci atıcı alayın 9-cu rotasının atıcısı olmuşdur. 5 mart 1942-ci ildə onun xidmət etdiyi rotanı bütünlüklə alman faşistləri əsir götürmüşdür.

Xanlar Kərimovun qardaşı uşaqları Kərimov Qəşəm Saleh oğlu (1914-1996) və Kərimov Əli Hüseyn oğlu (1925-2000) da müharibədə iştirak etmişlər. Qəşəm Kərimov 1943-cü ildə II qrup əlil kimi, Əli Kərimov isə 1949-cu ildə ordudan təxris olunmuşdur. Qeyd edək ki, Xanlar Kərimovun bacısı Şəkərin 1915-ci il təvəllüdlü övladı Xəlilov Niftalı Əziz oğlu da 1941-ci ildə müharibəyə getmiş və itkin düşmüşdür. 1953-cü ildə onun Türkiyədə yaşadığı məlum olmuşdur. Niftalı Xəlilov 1991-ci ildə Türkiyədə vəfat etmiş və orada da dəfn edilmişdir.

**Kərimov Məhəmməd Kərbəlayi Əmrah oğlu** 1903-cü ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. 1941-ci ilin noyabr ayında Basarkeçər RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər Məhəmməd Kərimov müharibədə itkin düşmüşdür. Oğlu Haris Əmrahov söyləyir ki, müharibədən sonra Amerikada yaşayan Məhərrəm Musayev kəndə gələndə deyirdi ki, Məhəmməd Kərimovu 1946-cı ildə Almaniyada görmüşəm.

Məhəmməd Kərimovun 1930-cu il təvəllüdlü oğlu Namaz 1953-cü ildə indiki Sankt-Peterburq şəhərində hərbi xidmətdə olarkən döyüşdə həlak olmuş və Sankt-Peterburq şəhərində dəfn olunmuşdur.

**Kərimov Müzəffər İsmayıl oğlu** 1920-ci ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. 1939-cu ilin noyabr ayında Basarkeçər RHK-dan orduya çağırılmış, Rus-Fin müharibəsində iştirak etmişdir. 1941-ci ilin noyabrında sıravi əsgər Müzəffər Kərimov müharibədə itkin düşmüşdür.

Müzəffər Kərimovun özündən böyük qardaşları İslam (1905-1994) və Rəsul (1919-1992) Kərimovlar da müharibə iştirakçıları olublar. Hər ikisi müharibədə yaralanmış və müharibə veteranı kimi tərxis olunaraq doğma kəndlərinə qayıtmışlar.

**Balıyev Qoşun Tahar oğlu** 1920-ci ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. 1939-cu ildə Basarkeçər RHK-dan orduya çağırılmışdır. Rus-Fin müharibəsində iştirak etmişdir. Sıravi əsgər Qoşun Balıyev müharibədə itkin düşmüşdür.

Qoşun Balıyevin qardaşı Mehvalı (1926-1953) və əmisi oğlu Elləz Balıyevlər də müharibə iştirakçıları olublar. 1913-cü il təvəllüdlü Elləz Mürsəl oğlu Balıyev 1943-cü ildə biləkdən sol əlini itirmiş, I qrup əlil kimi müharibədən qayıtmışdır. Çox zəhmətkeş, qohumcanlı olan Elləz Balıyev 1977-ci ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində vəfat etmişdir.

**Hacıyev Nəsib Məhərrəm oğlu** 1909-cu ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. O, Daşkəndin "Qırmızı Rəncbər" kolxozda briqadir işləmişdir. 1941-ci ilin iyul ayında Basarkeçər RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər Nəsib Hacıyevdən 1942-ci ilin aprel ayından sonra haqqında heç bir məlumat olmamış, müharibədə itkin düşmüşdür. Onun 1942-ci ildə

Krımda həlak olduğu ehtimal edilir. Müharibədən qayıtdıqdan sonra Fəzi Kərimov danışırmış ki, – 1942-ci ilin əvvəlində Nəsibi bizim dviziyada bir kəndçimiz (Fəzi baba bunu mənə də danışmışdı təəssüf ki, həmin adamın adını unutmuşam – A.Y.) görüb və mənə dedi ki, Nəsibi burda gördüm. Əsgərlər çox olduğundan Nəsibi nə qədər axtardım tapa bilmədim.

**Hacıyev Zülfüqar Məhərrəm oğlu** 1912-ci ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. 1938-ci ildə kənddə adam öldürdüyünə görə həbs olunmuşdur. Göyçə gölünün qərb sahilindəki Kəvər türməsində cəza çəkirmiş. 1939-cu ildə Rus-Fin müharibəsi başlayanda Kəvər türməsindən orduya göndərilmişdir. Rus-Fin müharibəsində iştirak etmişdir. Sıravi əsgər Zülfüqar Hacıyev müharibədə itkin düşmüşdür.

Müharibədə itkin düşən Nəsib və Zülfüqarın böyük qardaşları dövrünün tanınmış dini xadimi, şair Həsən Xəyallı (1903-1966) da 1942-ci ildə müharibəyə getmiş və 1945-ci ildə müharibədən üç ay sonra ordudan tərxis olunaraq doğma kəndə qayıtmışdır.

**Hacıyev Məhəmməd Oruc oğlu** 1915-ci ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. 1941-ci ilin iyul ayında Basarkeçər RHK-dan orduya çağırılmışdır. 1942-ci ilin yanvar ayında sıravi əsgər Məhəmməd Hacıyev müharibədə itkin düşmüşdür.

# FƏZİ MƏŞƏDİ QASIM OĞLU

Atalar düz deyibmiş: – "Ot kökü üstə bitər". Belə ki, keçən əsrin əvvəlindən bu günə qədər davam edən haqsızlıq mübarizəsində vətənini, torpağını, xalqını sevən bir böyük nəslin yetirməsi, qəhrəman, igid, ulu sərkərdə Məşədi Qasım Hacı Kərim oğlunun mübarizə yolunu bu günə qədər onun nəvə-nəticələrinin, davamçılarının layiqincə, qəhramanlıqla davam etdirmələri öz təsdiqini tapmışdır.

Məşədi Qasımın oğlu, elin, obanın sevimli ağsaqqalı, şairi Fəzi Kərimov 1914-cü ildə Göyçə mahalınının Daşkənd kəndində anadan olub. 1941-ci ildə Böyük Vətən Müharibəsinə getmiş, müharibədə topçu komandiri olmuş, 8 dəfə yaralanmış, orden və medallarla təltif olunmuşdur. Onun keçdiyi qəhrəmanlıq yolu Sankt-Peterburq arxivində də rəsmi sənədlərdə öz əksini tapıb. Fəzi Kərimov 1944-cü ildə müharibədən yaralı qayıtmışdır. 1953-cü ildə bir çox göyçəlilər kimi o da Bərdədə məskunlaşmalı olub. Üç oğlunun (Səməndər, Yüzasif, Qiyas) vaxtsız vəfatı, oğlu Yasifin Qarabağda (22.08.1992) şəhid olması ilə əlaqədar «Qəmgin» təxəllüsü ilə şeirlər yazıb.

Fəzi Məşədi Qasım oğlu uzun müddət kolxoz sədri, sovet sədri, ferma müdiri və başqa rəhbər vəzifələrdə işləmiş, el arasında böyük hörmət sahibi olan ağsaqqallardan olmuşdur. 25 sentyabr 2000-ci ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində vəfat etmişdir. Müdrik el ağsaqqalı, məclislərin yaraşığı Fəzi kişi Yeni Daşkənd kənd qəbiristanlığında, oğlanlarının yanında dəfn olunmuşdur.

1996-cı ildə Azərbaycan Tərcümə Mərkəzi «Qızıl Şərq» mətbəəsində Qəmgin Fəzinin «Ağrı dağı» adlı 168 səhifəlik şeirlər kitabını çap etdirmişdir. Seçilmiş əsərlə-

rindən və onun haqqında yazılan məqalələrdən ibarət yeni kitabı isə nəşrə hazırlanır.

Fəzi kişinin özündən böyük qardaşı **Kərimov Sayad Məşədi Qasım oğlu** 1905-ci ildə Göyçə mahalınının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. Sayad Kərimov yaxşı atıcı olduğuna görə 1920-ci illərdə yaranmaqda olan Ağdam milis idarəsinə işə qəbul edilmişdir. Məşədi Qasımın vəfatından sonra onun uşaqlarını qardaşı Kərbəlayi Əmrah Qarabağa gələrək doğma ata-baba yurdları olan Göyçəyə aparmışdır.

1941-ci ildə Sayad Kərimov Basarkeçər RHK-dan orduya çağırılmışdır. Müharibədən sonra ordudan tərxis olunmuş, 1953-cü ildə ermənilərin deportasiya siyasəti nəticəsində qardaş-bacıları, yaxın qohumları və həmkəndliləri ilə birlikdə Bərdə rayonuna köçürülmüşdür.

Sayad Kərimov 1955-ci ildə Göyçəyə qohumlarının yas mərasiminə gedərkən Kəlbəcər rayonunda avtomobil qəzasında həlak olmuş və doğulduğu Basarkeçər rayonunun Daşkənd kəndində dəfn olunmuşdur.

Fəzi Kərimovun bibisi Baharın oğlu və həm də bacısı Narının həyat yoldaşı **Kazımov İsrafil Kərbəlayi Zeynal oğlu** 1896-cı ildə Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində doğulmuşdur. Basarkeçər RHK-dan Böyük Vətən Müharibəsinə çağırılmışdır. 60-cı atıcı briqadanın atıcısı olan qızıl əsgər İsrafil Kazımov 1943-cü ilin 30 aprelində döyüşdə həlak olmuşdur. O, Krasnodar vilayəti Krım rayonu Neberdjayev stansiyasının 4,5 km şərqində dəfn edilmişdir.

Allah Vətən uğrunda canını fəda edənlərə rəhmət eləsin!

# ŞƏHİD YASİF KƏRİMOVUN BABASI İGİD EL QƏHRƏMANI MƏŞƏDİ QASIM HAQQINDA



## KİMƏ DEYİM FƏRYADIMI

Dədə Ələsgər, Aşıq Nəcəf, Aşıq Əsəd, Növrəs İman, Usta Abdulla kimi misilsiz saz və söz ustadlarının vətəni Göyçə mahalı olmuşdur. Bu səfalı yerə inqilabdan əvvəl və sonra ermənilər köçmüş, elə həmin vaxtlardan da hərc-mərclik, münaqişə yaratmağa çalışmışlar.

Bilərəkdən təxribatçılıq edən mənfur erməni millətçiləri burada yerli azərbaycanlılara göz verib işıq verməmiş, onları təqiblərə məruz qoymuşlar. Erməni quldurları Göyçə mahalına sahib olmaq həsrətini çəkirdilər.

Hələ 1918–1919-cu illərdə milli ixtilaf dövründə Ana torpağı qorumaq məqsədi ilə Göyçə mahalının igid oğulları silaha sarılaraq düşmən təcavüzlərinə əzmlə müqavimət göstəriblər.

Bu döyüşlərdə igidlik göstərən xalqımızın qeyrətli oğullarından biri Daşkəndli Məşədi Qasım Hacı Kərim oğlu olmuşdur. (Bax: Azərbaycan SSR EA xəbərləri, №4, 1989. s.87,91)

Məşədi Qasım dəfələrlə Bakıya, N.Nərimanova teleqram vurub erməni quldur dəstələrinin Azərbaycan kəndlərini yandırıb, sakinləri olmazın əzab-əziyyətlərə düçar etməsi, dəhşətli qırğınlar törətməsi barədə məlumat vermiş, ondan kömək istəmişdir.

Göyçə münaqişəsində ingilislərə arxalanan erməni daşnakları dinc əhaliyə divan tutmuş, çoxlu insan tələfatlarına səbəb olmuşlar. Belə bir çətin məqamda ölümü Vətən ayrılığından üstün tutan Məşədi Qasım qan düşməni olan Daşkəndli həmkəndlisi İdris Kalvayı Rüstəm oğlunu Vətənin, torpağın köməyinə, müdafiəsinə çağırmışdır.

Erməni cəlladlarının Daşkənd kəndinə olan hücumları zamanı Məşədi Qasım bir neçə igidlə birlikdə günlərcə acsusuz müqavimət göstərmişdir.

Daşnaq Selikovun quldur dəstəsi kəndi talamış, Məşədi Qasımın Daşkənddəki var-dövlətini də dağıtmış, hətta onun tutulması məqsədi ilə çoxlu qızıl mükafatı ayırmışdı.

Belə ağır məqamda Məşədi Qasım Şuşalı Axund Məmmədqulu tərəfindən Laçınlı Sultan bəyin məktubunu almışdır. Bu məktubda onu Qarabağa, azərbaycanlıların köməyinə dəvət edirdilər. Beləliklə, Məşədi Qasım öz yaxın qohumu Ziyadla Əsgərana – Malıbəyli kəndinin köməyinə gəlmiş, 14 gün mühasirədə olmasına baxmayaraq, igidliklə atışmışdır. Həmin döyüşün şahidi olan yaşlı adamların söylədiklərinə görə, onun bir gülləsi belə boşa çıxmamış, 7 nəfər patron daşıyanı olmuşdur.

Sonralar Məşədi Qasım Ağdam rayonunun Əhmədəvar kəndində Hacı Zeynalın evində qalmışdır. Həmin müddətdə Xocalı kəndi ona bağışlanmışdır. O, bu təklifə razı olmamış, xidmətə görə dəvət olunduğu Ağdam rayonu milis şöbəsində dəvət olunduğu vəzifəyə igidlikdə ad qazanmış böyük oğlu Sayadı məsləhət bilmişdir.

Aranın ağır təbiətinə, böyüyüb boya-başa çatdığı doğma torpağın ayrılığına tap gətirə bilməyən Məşədi Qasım Əhmədəvar kəndində ömrünün son günlərini yaşamış, öz vəsiyyəti ilə Şuşalı olan köhnə dostu Axund Məmmədqulunun evində axirət dünyasına köçmüşdür.

Hazırda həmin kənddə kənd camaatının dərin hörmətini qazanmış böyük qızı mərhum Məleykənin çoxlu nəvə-nəticəsi yaşayır.

Atası barədə eşitdiklərini, o vaxtkı hadisələri güclə xatırlayan yeganə oğlu, el ağsaqqalı, hazırda Bərdə rayonu Yeni Daşkənd kəndində yaşayan çoxlu övlad, nəvə-nəticə tərbiyə edən, böyüdüb boya-başa çatdıran, Böyük Vətən müharibəsi əlili Kərimov Fəzi Qasım oğlu, qəddar erməni quldurlarının Göyçə mahalının camaatına qarşı etdikləri vəhşiliklərdən birini belə xatırlayır: Göyçə toy mərasimlərinin birində silahlı erməni quldurları tərəfindən əsir tutulan sevimli el aşığı Aşıq Nəcəf onların təkidi ilə 2 gün acsusuz çalıb-oxumuş, ələ salınmışdır. Buna dözməyən polkovnik Selikovun arvadı məclislərin birində irəli çıxıb aşığı müdafiə etmiş, qudurğan daşnak zabitlərinin hərəkətlərinə etirazını bildirmiş, hətta aşığı yıxıb təpikləyən, yekəpər daşnak kapitanını sillə ilə vurmuş, üstünə qışqırmışdır. Arvadının bu hərəkətinə dözməyən Selikov ordaca onu güllə ilə öldürmüşdür. Bu əhvalatdan sonra Aşıq Nəcəf Çaxırlı kəndi ilə Basarkeçər (hazırkı Vardenis rayonu) arasında olan Kül təpəsinin üstündə kürəyinə qaynayan samovar bağlanaraq ağır işgəncə ilə qətlə yetirilmişdir.

Əsir düşərkən heç bir köməyə gümanı olmayan Aşıq Nəcəfin son məqamda söylədiyi “Bir xəbər gətir” şeirində Məşədi Qasımı haraya çağırması onun igidliyinə bir daha sübutdur:

Könül quşu uç get ana Vətənə,
Mənə o yerlərdən bir xəbər gətir.
Əhvalımı yetir nər igidlərə,
Qasımı, Ziyadı bir təhər gətir.

Görən nələr çəkir çarəsiz ana,
Deginən ömrü getdi bəd fəna,
Qoy düşmən gülləsi dəyməsin mana,
Daşkənddən içməyə tez zəhər gərir.

Samovarı bağladılar belimə,
Məşədi Qasım, nəriskardır elimə,
Bari ilahi əlin yetir əlimə,
Qohumdan, qardaşdan bir xəbər gətir.

Mən bilmədim polkovnikin adını,
Güllə ilə vurdu öz arvadını,
Kimə deyim fəryadımı, dadımı,
Qardaşdan, sirdaşdan bir xəbər gətir.

Nəcəf deyər, harda qaldı Gülüstan,
Şəmsəddin, Şəmistan, Mikayıl, Asdan,
İsmayıl körpədi çıxmadı yasdan,
İlahi üzünə xoş səhər gətir.

Vaxt gələcək xalqımızın haqq işi qalib gələcəkdir.

Qoy həmvətənlərimiz, igid babaların adlarını daşıyan balalar, doğma torpağın qorunması üçün vətənə vurğunluq, yurda bağlılıq ruhunda böyüsünlər.

Babalardan yadigar müqəddəs ana torpağın hər bir qarışını düşməndən qorusunlar.

**Azər Kərimov**
***"Vətən səsi" qəzeti,***
***№11(47). 14 mart 1991-ci il.***

## GÖYÇƏ MAHALINDA 1917-1920-Cİ İLLƏRİN HADİSƏLƏRİ

Böyük Ermənistan dövləti yaratmaq xülyasında olan, 1893-cü ildə yaranmış, millətçi "daşnak" ("Daşnaksutyun") partiyasının başçılığı altında erməni cəlladları, XX əsrin əvvəllərində 1905, 1914-1915, 1917-1919, 1918-1920-ci illərdə Zəngəzur, Zəngibasar və Göyçə mahallarına hücum etmiş, qanlı faciələr törətmişlər. I Dünya Müharibəsi illərindəki (1914-1918) vəziyyətdən istifadə edən erməni cəlladı, qaniçən Andronik Uzunyanın şəxsi heyəti daşnaklardan və müsəlman, türk, azərbaycanlılara düşmən xaçpərəst ermənilərdən ibarət nizami ordusu məkrli siyasətə xidmət edən bir neçə polkovnikin rəhbərliyi ilə Göyçə mahalına hücum edir. Ordunun bir hissəsi Göyçə gölünün şimal, digər hissəsi isə cənub sahili ilə qərbdən şərqə doğru hərəkət edir. Kəndlərdə bir neçə dəfə güclü müqavimətə rast gəlir və bir neçə ay Göyçə mahalının Basarkeçər rayonuna ayaq basa bilmir.

Yaşlı ağsaqqalların eşitdiklərinə və söylədiklərinə görə Göyçə gölünün cənubunda yerləşən Ağzıbir (Hacı Muğan) və Ağqala kənd sakinləri Kəvər rayonunda Mir Məcid ağanın köməyi ilə Ağqalalı Vəli, Musa və İsa qardaşlarının təşkil etdiyi döyüşçü dəstələri düşmənin irəliyə doğru hərəkətinin qarşısını almış və məğlubiyyətə uğratmışdılar.

1919-cu ilin əvvəllərində öz çirkin niyyətlərini həyata keçirmək üçün daşnak ordusu güclü silahlarla silahlanaraq, Göyçə gölünün cənub sahillərini işğal edib, Qaranlıq (Martuni) rayonu ərazisində, Gözəldərə ətrafında güclü müqavimətə rast gəlirlər. Gözəldərə (Vartenik) və Çamırlı kəndləri ətrafındakı vuruşmalara Basarkeçər rayonunun böyük kəndlərindən Zod, Nərimanlı, Şişqaya, Daşkənd və s. könül-

lü dəstələr təşkil olunub göndərilir. Daşkənddən təşkil olunmuş könüllü dəstələr, ana babam Məşədi Qasım Hacı Kərim oğlunun və İdris Süleymanovun başçılığı ilə köməyə gedir.

Bu bir həqiqətdir ki, Çamırlı döyüşlərində xeyli yaralananlar olur. Daşkəndin Qızıl Hacılı tayfasından olan Süleymanov Əliş Sevdalı Hüseyn oğlu həlak olur. Onu gətirib Daşkəndin qəbristanlığında dəfn edirlər.

1919-cu ilin əvvəlində gölün şimal tərəfi ilə Basarsakeçərə tərəf hərəkət edən erməni ordusu Toğluca, Cil, Ardanış kəndlərində ağır itkilərə məruz qalır. Ardanışdan igid və cəsur Məşədi Hümbətin, Toğlucadan Cığal Həsən və Topal Orucun könüllü dəstələri daşnak ordusuna ağır zərbələr endirir, lakin, təpədən dırnağa qədər silahlanmış ermənilər Göyçə gölünün hər iki sahilində yaşayan azərbaycanlılara divan tutur, varını, sərvətini talan edir, kəndləri talayıb Basarkeçər rayonu ərazisinə daxil olurlar.

Şişqaya kəndində daşnak cəlladları qarşılarına çıxan azərbaycanlıları Kor Tanrıverdi adlı varlı bir şəxsin mal tövləsinə doldurub, od vurub yandırmaq, tüstü ilə boğmaq kimi işgəncələrlə məhv etmək istəyirlər. Ermənilər tövlənin ətrafında gözətçilər qoyurlar. Deyilənlərə görə Daşkənd sakinlərindən Molla Abuzəri, onun əmisi oğlu Hasanqulunu və mahir saz və söz ustası, aşıq sənətinin görkəmli dahilərindən biri, oxuyanda 20-30-luq çıraqları məlahətli səsi ilə söndürməyə qadir olan Aşıq Ələsgərin sevimli şəyirdi Aşıq Nəcəfi də Şişqayada həmin tövləyə salırlar. Hasanqulu kişi bu hiyləni başa düşüb, fürsət tapıb tövlənin qaranlıq bir yerində pərdiləri sındırıb deşik açır və Molla Abuzəri də çıxarıb qaçır. Hasanqulu kişi qoçaq imiş, həm də qaçaq olubmuş. Bu zaman gözətçilər onları görüb tutmaq istəyəndə Hasanqulu kişi cibindən qızıl pulları çıxarıb səpir, gözətçilər ton-

qalın işığında pulları görüb yığanda onlar qaçıb canlarını qurtarırlar. Bunlar qaçanda Aşıq Nəcəfə əlləri çatmır.

Tövlə qaranlıq olduğundan və onlar qaçanda Aşıq Nəcəf yanıqlı-yanıqlı oxuduğundan çıxıb qaçmasına imkan olmur. Aşıq Nəcəfin yaxşı oxumağını görəndə tövləyə od verən daşnaklar onu oradan çıxarıb Qızılbulaq (Çaxırlı) kəndinə aparırlar. Orada onu bir neçə gün oxutduqdan sonra öldürməyi qərara alırlar. Tövləyə od verib yüzlərlə azərbaycanlını işgəncələrlə məhv edirlər. Bu faciənin həqiqət olduğunu Molla Abuzər və eşidənlər dəfələrlə söyləmişlər. Molla Abuzər 1956-cı ildə Bərdə rayonunun Yeni Daşkənd kəndində vəfat etmişdir.

Bu hadisələri Hatəm səxalı, el-oba qədri bilən Zod kəndinin adlı-sanlı sakini Səməd ağa eşidir. Göyçə mahalının böyük kəndlərindən olan cəsur, təmkinli, müdrik ağsaqqalları Zod kəndinə çağırtdıraraq daşnaklara qarşı tədbir görmək və məsləhətləşib mübarizə aparmağı qərara alır.

Daşnaklar isə işğal etdikləri kəndləri talan edir, öz köhlən atlarına arpa toplayaraq Zoda doğru irəliləyir. Səməd ağanın çağırışına cavab olaraq Zodlu Məşədi Məcid, Qaraimandan Məşədi İsə, Daşkənddən Məşədi Qasım, Hacı Rəhim, Tağının oğlu Məhərrəm, Kərbəlayi Zeynal, Nərimanlıdan Məşədi Mehdinin başçılığı ilə nümayəndələr, tanınmış şəxsiyyətlər Zod kəndinə yığılıb məsləhətləşirlər. Bu zaman daşnak ordusunun bir komandiri, Andronik Uzunyanın silahdaşı polkovnik Sulikov öz dəstəsi ilə Zoda daxil olmaq istədikdə güclü müqavimətə məruz qalır. Sulikovu Yusif adlı bir Zodlu vurub yaralayır. Sulikovda iki tapança varmış, onun biri əlindən düşüb irəli atılır. İkinci tapança ilə o da iki Zodlunu vurur. Həmin anda Daşkəndli Hacı Rəhim Sulikovun başını kəsir.

Sulikov öldürüldükdən sonra daşnak dəstələri Zoddan qaçıb Qızılbulaq (Çaxırlı) kəndində başqa bir polkovnikin yanında toplaşırlar. Deyilənlərə görə Daşkəndli Aşıq Nəcəfi Şişqayadan Qızılbulağa gətirib, həmin kənd sakini Böyük Ağanın tikdirdiyi böyük bir otaqda bir neçə gün oxutduqdan sonra daşnaklar tarixdə görünməyən amansızlıqla, işgəncə verməklə, yəni belinə qaynar samovar bağlayıb öldürmüşlər. Bu hadisələrin həqiqət olduğunu dillərdə əzbər olan Aşıq Nəcəfin bir neçə şeiri, o cümlədən onun "Bir xəbər gətir" adlı qoşması da təsdiq edir. Həmin qoşmanı olduğu kimi Sizə təqdim edirəm.

Könül quşu, uç get Ana Vətənə,
Elimdən, obamdan bir xəbər gətir!
Əhvalımı yetir nər igidlərə
Qohumdan, qardaşdan bir xəbər gətir!

Əzizinəm hər aylar,
Hər həftələr, hər aylar.
Başım cəllad əlində
Dilim sizi haraylar.

Kimə qılım, fəryadımın dadını,
Mən bilmədim polkovnikin adını.
Bu insafsız vurdu öz arvadını
Yoldaşdan, sirdaşdan bir xəbər gətir!

Əzizinəm ələ bax,
Əmələ bax, ələ bax,
Zülm edən, qanlar tökən
O insafsız ələ bax.

Qaynar samovar bağladılar belimə,
Məşədi Qasım pəliskardı elimə,
Barilahim əlin yetir əlimə
İdrisdən, Ziyaddan bir xəbər gətir.

Yox aşıq minən gələ,
Düşmüşəm min əngələ.
Dərdimin bu vaxtında
Düldülü minən gələ.

Görsən nalə çəkir uğursuz ana,
Deginənki, ömrüm gedir bəd fəna.
Düşmənin gülləsi dəyməsin mənə,
Daşkənddən içməyə bir zəhər gətir.

Mən aşıq ay azaldı,
Gün keçdi, ay azaldı.
Qəddar əlinə düşdüm
Ömrüm də ay azaldı.

Nəcəf deyər, harda qaldı Gülüstan,
Şəmiddin, Şəmistan, Mikayıl, Astan,
İsmayıl körpəydi, çıxmadı yasdan
İlahi, mənə bir xoş xəbər gətir.

Əzizinəm gəmi gəldi,
Dəryadan gəmi gəldi.
Üzündən öpəmmədim
Ayrılıq dəmi gəldi.

Gülüstan Aşıq Nəcəfin ömür-gün yoldaşı, Şəmiddin, Şəmistan, Mikayıl, Aslan və İsmayıl isə oğlanları imiş.

Qızılbulaqda erməni ordusuna Andronikin əmri ilə yeni güclü qüvvələr göndərilir, həm də zəmanəyə görə güclü silah olan top əldə edirlər. Daşnaklar Daşkənd kəndini hədəfə tuturlar. Bu zaman Məşədi Qasımın başçılığı ilə Süleymanov İdris Kərbəlayi Rüstəm oğlu, Babayev Ziyad və Koralların Vəlisi Daşkənd sakinlərini qorumaq üçün təsəvvür edilməz dərəcədə şücaət göstərirlər. Kəndin qərbində Oyuqlu təpəsində və Dəmyədə səngər qazıb kəndi müdafiə edirlər.

Bunları gözü ilə görən yaşlı kişilərin dediyinə görə Oyuqlu təpəsində topun gülləsi Məşədi Qasımın atını öldürür. Məsafə qismən uzaq olduğundan bunların atdığı güllələr topla silahlanmış erməni ordusuna çatmır. Ermənilər topla fasiləsiz həmlələr endirirlər. Səngərin torpağı bunların üstünə uçur. Fürsətdən istifadə edib Məşədi Qasım İdrisin atına minib oradan qaçaraq kəndin şərqində "Səngər təpəsi" və "Uzun güneydə" səngər qazıb ermənilərə cavab atəşi açırlar və kəndin camaatını xilas edirlər. Bir müddətdən sonra Daşkəndin sakinləri həmin dağılmış səngərlərdən "Beşatılan" tüfəngin patronlarını, gilizlərini, daraqlarını və top güllələrini tapmışdılar. Bunlara baxmayaraq Göyçə mahalı güclü, nizamlı daşnak ordusu tərəfindən işğal edilir.

1919-cu ilin aprel ayının 15–20-də pis hava şəraitində Daşkəndlilər "Tərsə", "Keyti" dağlarından aşıb Kəlbəcər rayonunun kəndlərində pənahlanırlar. Bu hadisələr zamanı onlarla qoca, qadın və uşaq həlak olur. Göyçə mahalı işğal olandan sonra Məşədi Qasım eşidir ki, Andronik öz ordusu ilə Qarabağa hücum edir. Bu hücuma qarşı Laçınlı Sultan bəy mübarizə aparır. Məşədi Qasım Kəlbəcərdən Sultan

bəyin yanına gedir. Göyçədə baş verən faciəli hadisələri Sultan bəyə söyləyir. Sultan bəy Məşədi Qasımın ağıl və şücaətini görüb, özü ilə daşnaklara qarşı vuruşmağını məsləhət bilir. Qarabağda daşnak ordusu məğlubiyyətə uğrayaraq Andronik oradan qaçandan sonra Sultan bəy qubernator vəzifəsində işləyən qardaşı Xosrov bəylə məsləhətləşib Ağdam rayonunda, Xocalı ətrafında bir kənddə Məşədi Qasıma yer verir və o kəndin idarə olunmasını ona tapşırır. Məşədi Qasım burada yaşamalı olur. Onun qızı Məleykə xanım orada Əşrəf bəy adlı bir şəxslə evlənir. Onun iki oğlu Knyaz və Sahib, iki qızı Dilşad və Hamar adlı övladları olur. Məleykə xanımın Hamardan olan nəvələri indi də yaşayırlar. 1993-cü ildə məcburi qaçqın düşərək Mingəçevir şəhərində məskunlaşırlar. Onlar son vaxtlar Ağdamın Əhmədavar kəndində yaşayırmışlar. Məşədi Qasım və həyat yoldaşı Ceyran xanım deyilənə görə 1920-ci ildə orada dünyasını dəyişirlər. Ondan sonra Məşədi Qasımın iki oğlu Sayad və Qəmgin Fəzi və bir qızı orada qalır. 1921-ci ildə Göyçəlilər və o cümlədən Daşkəndlilər öz doğma yurdlarına, Göyçəyə qayıdırlar. Məşədi Qasımın yetim qalmış uşaqlarını qardaşı Kərbəlayi Əmrah və kürəkəni Kərbəlayi Zeynal Qarabağdan Göyçəyə gətirir. Onların atalarının doğma ocağında böyüməsinə və yaşamasına şərait yaradırlar.

İndi Məşədi Qasımın kiçik oğlu Fəzinin övladları Bərdə rayonunun Yeni Daşkənd kəndində və Bakı şəhərində yaşayırlar.

**Xasay Zeynalov**
***"Göyçəsiz günlərim" kitabı,***
***Bakı, "Nurlan", 2006***

## AY BABA

***XX əsrin əvvəllərində daşnaklara qarşı məharətlə vuruşan babam Məşədi Qasımın xatirəsinə***

Haqq səni yaratdı cəsur bir insan
Gecəni gündüzə qatdın, ay baba.
Elinə, obana hey həyan olub
Nə qədər səngərdə yatdın, ay baba.

Şahiddi “Oyuqlu”, “Səngər təpəsi”,
İdris, Ziyad, Koralların Vəlisi,
Atını öldürüb topun gülləsi
Dizədək torpağa batdın, ay baba.

Gecə-gündüz köhlən atınla getdin,
Şəhri Xorasana bir səhər yetdin,
İmami Rzanı ziyarət etdin
Arzu, amalına çatdın, ay baba.

Vüqarlı dağlardan ilhamın aldın,
Şücaət göstərdin, eldə ucaldın,
Şərəflə Məşədi adını aldın
Parlaq günəşiydin, batdın, ay baba.

Xasayam, yaxşını pisdən seylədin,
Daşnakları dağa-daşa teylədin,
Sultan bəylə sadiq dostluq eylədin.
Dəyişdin dünyanı, getdin, ay baba.

**Xasay Zeynalov**
***“Göyçəsiz günlərim” kitabı,***
***Bakı, “Nurlan”, 2006***

## GÖYÇƏLİ SƏRKƏRDƏ MƏŞƏDİ QASIMIN ƏSGƏRAN DÖYÜŞÜ

Təkcə tarixi ərazi kimi deyil, qədim oğuz yurdunun həyata bəxş etdiyi Allah vergisi qədər müqəddəs olan ulu Göyçənin ürəyi sayılan, zamanın sərt sınaqlarına sinə gərən, öz igidləri, ərənləri, qeyrətli oğulları ilə diqqəti daha çox cəlb edən, tarixi ensiklopediya qədər geniş olan, Əmir Teymur kimi məşhur bir fatehin nəzərindən yayınmayıb, onun tərəfindən adı tarixə həkk olunan ulu Daşkənd əsrlər boyu mahalda, eldə sayılıb seçilən bir cənnətməkan olmuşdur. Bununla bahəm o, tarix qarşısında heç də borclu qalmayıb. Ona dağ vüqarlı, pəhləvan cüssəli, Savalan duruşlu, Qoşqar əzəmətli Məşədi Qasım, Hacı Rəhim, Qaçaq İdris, Nağı bəy, Koroğlu Məhəmməd, Vəli, Ziyad kimi ərənlər, igidlər bəxş etmişdir.

Günəş qədər möhtəşəm, ocaq kimi müqəddəs olan bu kənd Məşədi Qasım kimi bir azmanı bəxş etməklə ürəklərə istilik, damardakı qanlara qeyrət, iradələrə bir möhkəmlik gətirmişdir. Haqqında söhbət açacağımız qeyri-adi insan, mərd, cəsur, qorxmaz, qeyrət və namus təcəssümü olan Məşədi Qasım bu kəndin, bu məkanın ərsəyə gətirdiyi əvəzolunmaz tarixi bir şəxsiyyəti olubdur.

Rəsilli nəslindən olan Məşədi Qasım Hacı Kərim oğlu 1860-cı ildə Daşkənd kəndində dindar ailədə həyata göz açmışdır. Hələ uşaqlıq illərində onun davranışında, hərəkətlərində xüsusi əlamətlər duyulurdu. Həyata açıq gözlə baxan, uşaq ikən çəldliyi, at minməyi, öz tay-tuşları ilə güləşməyi, qılınc oynatmağı, quşu göydə güllə ilə gözündən vurmağı onun qeyri-adi olmağının xüsusi təzahürləri idi.

İllər bir-birini əvəz etdikcə Məşədi Qasım daha da püxtələşirdi, həqiqi mənada həyatda bişirdi. O, xalqın doğmasına, istəklisinə çevrilir, ürəklərdə yurd-yuva salırdı.

Həyatda baş verən olaylar onun maraq dairəsini daha da genişləndirirdi. Az keçmir ki, müqəddəs sandığımız Allah evinə ziyarət onun qəlbinə, duyğusuna siraət edir. Çox güman ki, imkanlı dindar bir ailədə onun ziyarətə getməməsi mümkün deyildi. Ona görə də böyük bir həvəslə İranın Məşhəd şəhərinə gedərək oranı ziyarət edib hörmətli, kamallı bir məşədi kimi doğma Daşkəndinə qayıdır və Məşədi kimi sorağı bütün mahallara yayılır. Kasıblara, əlsiz-ayaqsızlara Hatəm səxavətilə kimliyindən asılı olmayaraq hamıya kömək durur. Həm məşədi kimi, həm böyük yenilməz bir igid kimi Məşədi Qasımın adı ətraf mahallara, kəndlərə ildırım sürətilə yayılır. Ulu Göyçənin ən qeyrətli, ən yenilməz, mərd, mübariz oğullarından biri və birincisinə çevrilir. Az müddət ərzində hamı ondan məsləhət almağa, nicat diləməyə pənah gətirir, görməyənlər onun nurlu çöhrəsini görməyə can atırlar.

Həm də bu o vaxta təsadüf edir ki, qan içən erməni daşnakları Azərbaycanın hər yerində – Qubada, Şamaxıda, Bakıda, Şəkidə, Ağsuda olduğu kimi Qərbi Azərbaycan torpağında da ölüm-dirim savaşına başlamışdılar. Erməni daşnaklarına layiqli cavab vermək üçün bütövlükdə Göyçə mahalının sayılıb-seçilən oğulları Qaranlıq (Martuni) rayonunun Alçalı-Çamırlı kəndlərinə toplaşaraq Türk dövlətçiliyi tərəfindən göndərilmiş türk paşasından döyüş taktikasının sirlərinə yaxından bələd olur və erməni daşnaklarına bu istiqamətdən lazımınca cavab verirlər. Bu ölüm-dirim savaşında özünün xüsusi çəkisi və ayrıca yeri olan daşkəndli Məşədi Qasım da öz ciyərparası olan böyük oğlu

Hüsənlə birlikdə çiyin-çiyinə ata-bala birlikdə səngərdə yüksək peşəkarlıqla erməni daşnaklarına yetərincə cavab verirdilər. Məşədi Qasımın atdığı güllənin birinin də hədəfdən yayınmadığını görən hərbi təlimi keçən türk paşası Məşədi Qasıma sərkərdə adı verərək onu 300 nəfərlik bir döyüşçü ordusuna komandir təyin etmişdir. Ölüm-dirim savaşının gün-gündən alovlandığını görən türk paşası silah-sursat gətirmək üçün sərkərdə Məşədi Qasıma onunla Türkiyəyə getməyi təklif edir və bu təklifi sərkərdə Məşədi Qasım qəbul edir. Türkiyəyə getmək Məşədi Qasımın maraq dairəsində idi. Çünki sərkərdə Məşədi Qasımın ulu babası XIV əsrdə Türkiyənin Sulduz vilayətindən Qazax rayonuna gəlmiş, oradan isə Göyçə mahalına səpələnmişlər. Sərkərdə Məşədi Qasım, oğlu Hüsən və bir neçə döyüşçü türk paşası ilə birlikdə Türkiyəyə gedirlər. Türkiyədə Nuru Paşa sərkərdə Məşədi Qasımın və şir biləkli oğlu Hüsənin hərəsinə bir dəst türk döyüşçüsünün paltarını hədiyyə etmişdir. Az müddət ərzində Türkiyədən sərkərdə Məşədi Qasım kifayət qədər silah-sursat və Göyçə mahalına bir uzaqvuran top gətirir. Qaranlıq, Çamırlı, Alçalı istiqamətində gedən şiddətli döyüşlərin birində sərkərdə Məşədi Qasımın ciyərparası, şir südü əmmiş oğlu Hüsən və həmkəndlisi olan Sevdalı Hüseynin oğlu Əliş həlak olmuşlar. Hər ikisi sərkərdə Məşədi Qasımın köməkliyi ilə öz doğma kəndlərində torpağa tapşırılmışdır.

Sərkərdə Məşədi Qasımın Türkiyədən gətirdiyi topun səsi-sorağı ətraf mahallara yayıldığı kimi Basakeçərdə erməni Avetis ağaya da çatmışdır.

Göyçədəki azərbaycanlı kəndlərini bir-bir qılıncdan keçirmək erməni daşnaklarının çoxdankı arzuları idi. Hər halda bu aqibət başqa kəndlər kimi Daşkəndi də gözləyirdi.

Daşnaklar ələlxüsus Məşədi Qasım kimi igidləri olan, qeyrətli say-seçmə oğulları olan Daşkəndi yerindən tərpətməyə birinci üstünlük verirlər. Amma bu yolda Məşədi Qasım böyük bir maneə kimi onların canına vəlvələ salmışdı. Əlbəttə, onlara məlum idi ki, məqsədə nail olmaq üçün birinci növbədə nəyin bahasına olursa-olsun Məşədi Qasımı aradan götürmək lazımdır.

Basarkeçərdə Avetis ağa barışıqlıq pərdəsi altında qonaqlıq düzəltdirir və Məşədi Qasıma xəbər göndərib onu qonaqlığa dəvət edir. Təklifi qəbul edən Məşədi Qasım Avetis ağanın evinə gəlir. Atdan düşərkən həyətdə kimsənin olmadığını bilən bir erməni qadını məsələnin nə yerdə olduğundan Məşədi Qasımı hali edir və deyir ki, «səni aradan götürmək üçün buraya çağırtdırıblar. Qaç buradan, canını qurtar». Son dərəcə ölümün fövqünə enməyən, qorxmaz və məğrur olan Məşədi Qasım erməni qadınına, «Kafərin gülləsi mənə dəyə bilməz» – deyib qonaqlıq adı ilə düzəldilmiş məclisə daxil olanda görür ki, Avetis ağa başının dəstəsilə onu gözləyir və hamısı silahlıdır.

Avetis ağa kinayə ilə Məşədi Qasıma deyir ki, «Bu nə cür qonaqlığa gəlməkdir?» Məşədi Qasım məsələdən hali olaraq şəstlə cavab verir ki, «Bu cür qonaqlığa bu cür də gələrlər».

Avetis ağa başının dəstəsinə him-cim edərkən dərhal Məşədi Qasım məsələnin nə yerdə olduğunu anlayır və cəld çuxasının altından onatılan silahını çıxararaq ermənilərə sarı tuşlayıb onların üstünə qışqıraraq deyir: «Yerinizdən tərpənməyin, yoxsa hamınızı qıraram».

Sərkərdə Məşədi Qasımın məğrur görkəmindən, qəzəbli zəhmindən qorxuya düşən və Məşədi Qasımın sərrast

güllə atması ilə yaxından tanış olan Avetis ağa, nə də onun başının dəstəsi Məşədi Qasıma güllə atmağa cəsarət etmirlər.

Məşədi Qasım bayıra çıxıb atını minərkən erməni qadını ona yalvarır ki, «Məşədi, səni and verirəm sizin Seyid Bayram ağaya ki, bizə dəymə. Özü də kəndinizə Daşkənd yolu ilə getmə. Erməni daşnakları Basarkeçərlə Daşkənd arasındakı Qaraburun deyilən yerdə pusqu qurublar. Səni öldürərlər. Kəndinizə Qoşabulaq istiqamətilə get». Məşədi Qasım erməni qadının sözünə məhəl qoymayıb Basarkeçərdən Daşkəndə uzanan yolla kəndlərinə yola düşür. Qaraburun adlanan yerdən gəlib keçərkən pusquda dayanmış ermənilər qəfildən Məşədi Qasımı güllə yağışına tuturlar. Düşmən gülləsi onun atını yaralayır. Atdan tullanan Məşədi Qasım cəld bir qayanın arxasına çəkilərək ermənilərlə atışmağa başlayır. Xeyli tələfatdan sonra ermənilər atışmanın mənasız olduğunu görüb qaçmağa öz tuturlar.

Həmin məqamda Qırxbulaq kəndindən bir erməni Daşkəndə Məşədi Qasıma xəbər göndərir ki, erməni daşnakları ingilislərdən top alıblar, həmin toplarla ermənilər bu gün Daşkəndə basqın edib yerli əhaliyə divan tutacaqlar. Ona görə də kəndi gecə ikən tərk etməyiniz məsləhətdir.

Lakin doğma ata-baba yurdunu tərk etməyi mənliyə sığışdırmayan Məşədi Qasım öz doğma kəndinin igid oğlanlarından Qaçaq İdris, Hacı Rəhim, Kalvayı Zeynal, Korallar tayfasından Vəli, Babakişilər tayfasından Ziyadla birlikdə Basarkeçərdən başlanacaq hücumun qarşısını almaq üçün Daşkəndin girəcəyindəki səngərdə mövqe tuturlar.

Məşədi Qasım ən etibarlı, yaxın silahdaşı kimi Kalvayı Zeynala patron daşımağı tapşırmışdı. Basarkeçərdən Daşkəndə uzanan yolu durbinlə müşahidə edən sərkərdə Məşədi Qasım görür ki, bir dəstə yaraqlı erməni topla bir-

likdə artıq Daşkəndə yaxınlaşırlar. Məşədi Qasım yaxınlaşan dəstə başçısını hədəfə alıb yerə sərir. Dəstə başçısının ölümünü görən dəstə üzvləri bir yanda mövqe tutur, topatanlar topu işə salırlar. Birinci və ikinci mərmi hədəfdən yayınır. Üçüncü mərmi topdan açılan kimi səngərin kənarında torpağı Məşədi Qasımın üstünə tökür. Bunu görən Qaçaq İdris bir əli ilə erməniyə güllə atır, o biri əli ilə torpağı təmizləyir.

Keçmişdən aralarında qatı düşmənçilik ədavətləri olan Məşədi Qasımla Qaçaq İdris kəndin müdafiəsini bir damarda axan qan kimi, bir bədəndə bölünməz ürək kimi bir səngərdə öz doğma kəndlərinin müdafiəsində dayanırlar. Döyüşün daha da şiddətləndiyini, özünün yaralandığını görən Məşədi Qasım Qaçaq İdrisə deyir ki, «İdris, qaç, səni öldürərlər». İdris isə cavab verir ki, «bu gün vətəni faciədən, fəlakətdən qurtarmalıyıq və sənin kimi qeyrətli bir sərkərdəni tək qoyub gedə bilmərəm. Burada ölsək də bir yerdə öləcəyik, qalsaq da».

Qaçaq İdrislə Kalvayı Zeynal yaralanan sərkərdə Məşədi Qasımı ata mindirib hadisə yerindən uzaqlaşdırırlar. Bu hadisədən sonra Məşədi Qasım yaralı halda Kəlbəcər rayonunun Bəzirxana kəndində dostunun evində sığınacaq tapır.

Göyçə qaçqınlığı zamanı Məşədi Qasımın həyat yoldaşı Ceyran və kiçik oğlu Dağbəyi Kəlbəcər rayonunda dünyalarını dəyişir və Başlıbelin Ağcaqız qəbirstanlığında dəfn olunurlar.

Göyçədə baş verən bu hadisələr eyni vaxtda Azərbaycanın müxtəlif yerlərində, ələlxüsus Qarabağda, Şuşada, Əsgəranda daha qızğın şəkildə baş alıb gedirdi. Həmin döyüşə Məşədi Qasımın yaxın dostu, əslən şuşalı olan,

varlı-hallı tacirlər taciri Dəmirçi Məmmədqulu və tarixdən tarixin daş yaddaşına çevrilmiş laçınlı Sultan bəy başçılıq edirdi. Göyçə mahalının dağılmasını ürək ağrısı ilə eşidən sərkərdə Məşədi Qasımın sadiq və ən yaxın dostu olan şuşalı Dəmirçi Məmmədqulu bu hadisədən çox təsirlənir və mütəəsir olur. Eşidilir ki, sərkərdə Məşədi Qasım Kəlbəcərin Bəzirxana kəndindədir. Dəmirçi Məmmədqulu dostu sərkərdə Məşədi Qasımla görüşmək üçün Kəlbəcərin Bəzirxana kəndinə gəlir və bu yenilməz sərkərdənin yüngül yaralandığını görüb sevinir. Hal-əhvaldan sonra o, Qarabağda da bu hadisələrin geniş qaydada vüsət almasını, dərinləşməsini sərkərdə Məşədi Qasıma bildirir. Qarabağda Məşədi Qasım kimi dəyanətli, cəsur, mətin bir sərkərdənin hava və su kimi lazım olduğunu dostu Məşədi Qasıma bildirir və ondan mənəvi dayaq, taktiki gedişdə dünyagörüşlü, bacarıqlı bir sərkərdə kimi kömək əlini uzatmağı xahiş edir. Həmin gündən etibarən Məşədi Qasım dostu Məmmədqulu ilə Qarabağda, əsasən, Əsgəranda cərəyan edən şiddətli döyüşə qoşulur. Az bir müddət ərzində misli görünməyən, böyük bir şücaətlə ad-san qazanıb ermənilərin canına vəlvələ salır və özünün yenilməz, mübariz sərkərdəlik bacarığı ilə elin qəlbində sönməz bir məşələ çevrilir. Əsgəran döyüşündə sərkərdə Məşədi Qasımın qoçaqlığı bütün mahallara, ellərə yayılır. Onun sədası öz maddi və mənəvi köməyini xalqına, vətəninə əsirgəməyən, özünün topxanası, cəbhəxanası olan laçınlı igid Sultan bəyə çatır. Ermənilərin bu geniş miqyaslı hücumu doğma qardaş ölkələrə də çatmışdı. Ona görə də Qarabağda, əsasən Əsgəranda baş verən qırğınların qarışısını almaq üçün, oraya xüsusi qüvvə göndərilməsi haqqında Nuru Paşa dərhal əmr vermişdir. Bu əməliyyata Bakı qarnizonunda olan və əməliyyatı həyata keçirəcək I Azər-

baycan diviziyasının komandanı polkovnik Cəmil Cihad bəy başçılıq edirdi. Əməliyyat ildırım sürətilə elə bir geniş vüsət aldı ki, bir yandan sərkərdə Məşədi Qasım, bir yandan Dəmirçi Məmmədqulu tərəfindən endirilən zərbə, digər tərəfdən aparılan uğurlu əməliyyatlar nəticəsində ermənilər təslimçilik əlaməti olaraq ağ bayraq qaldırmışlar.

Göyçə mahalının dağılması ilə əlaqədar olaraq Məşədi Qasım, Azərbaycan xalqının qeyrətli oğlu, SSRİ Xalq Komissarları Sovetinin sədri Nəriman Nərimanova, Gəncə quberniyasına və İrəvana buradakı vəziyyət haqqında teleqram vurur. Hər halda bu, Azərbaycan Elmlər Akademiyasının 1989-cu ildə çap olunmuş «Xəbərlər» jurnalının 4 saylı fəlsəfə və hüquq seriyasında 87-ci səhifəsində jurnalın baş redaktoru Azərbaycan SSR Elmlər Akademiyasının akademiki Ziya Bünyadov tərəfindən öz təsdiqini tapmışdır.

Ən başlıcası budur ki, əməliyyatın gedişində sərkərdə Məşədi Qasımın ifadə olunmaz dərəcədə şücaəti, misli görünməmiş qəhrəmanlığı Cəmil Cihad bəyi riqqətə gətirir və onda bu igidə qarşı çox böyük etibar, məhəbbət hissi oyanır. Əməliyyatın uğurla başa çatmasının Cəmil Cihad bəydə yaratdığı sevinc və xoş təəssüratlar, bir yanda sərkərdə Məşədi Qasımın bu bənzərsiz qoçaqlığı Cəmil Cihad bəyin ovqatına bir şirinlik, sərinlik gətirdi. Cəmil Cihad bəy sərkərdə Məşədi Qasıma yaxınlaşıb ona öz təşəkkürünü bildirir və ondan artıq dərəcədə xahiş edir ki, Məşədi Qasım onunla birlikdə Türkiyəyə getsin və orada hərbi komandanlıq tərəfindən ən böyük hərbi rütbəyə sahib olsun. Ancaq sərkərdə Məşədi Qasım bu torpaqdan kənarda bir anda olsun ayrı yaşamayacağını Cəmil Cihad bəyə birdirir. Məsələni bu cür görən Cəmil Cihad bəy əfəndim deyə belindəki türk tüfəngini hədiyyə olaraq sərkərdə

Məşədi Qasıma bağışlayır. Bu mənzərəni kənardan böyük diqqətlə müşayət edən sərkərdə Məşədi Qasımın yaxın dostu Dəmirçi Məmmədqulu və Laçının Qırxqız dağı qədər əzəmətli oğlu Sultan bəy də eşidir. Məşədi Qasıma yaxınlaşan Sultan bəy deyir: – «Bir halda ki, sən Cəmil Cihad bəyin təklifi ilə razı deyilsən, onda səndən xahiş edirəm gəl mənim böyük hərbi sursata malik olan topxanama, cəbhəxanama böyük bir sərkərdə kimi ağsaqqallıq, başçılıq et». Sərkərdə Məşədi Qasım cavab əlaməti olaraq Sultan bəyin təklifinə öz minnətdarlığını bildirir və ona deyir ki, «Sultan bəy təklifinizə görə çox sağ olun, amma məlumunuz olsun ki, mənim dostlarım çox olduğu kimi düşmənlərim də çoxdur. Əgər mən sizin təklifinizlə razılaşıb cəbhəxananıza, böyük topxananıza başçılıq etsəm, deyəcəklər ki, Məşədi Qasım qorxusundan Sultan bəyin himayəsinə sığınıb». Bu məqamı görən yaxın dostu Dəmirçi Məmmədqulu və Sultan bəy belə bir qərara gəlirlər ki, kəndlərdən birini hədiyyə kimi (hərgah bu, Ağdamın kəndlərindən biri olub, hal-hazırda da Qasımlı adını daşıyır) Məşədi Qasıma bəxş etsinlər və bu kəndin bütün baratı Məşədi Qasımın özünə məxsus olsun. Amma buna baxmayaraq Məşədi Qasım bir müddət ona bəxş olunan Qasımlı kəndində yaşadıqdan sonra ailəsi ilə birlikdə Ağdam rayonunun ərazisində Qarqar çayının kənarında yerləşən Əhmədavar kəndində Hacı Zeynalın karvansarasında qalır. Yeri gəlmişkən deyək ki, Məşədi Qasımın 4 oğlu – Hüsən, Sayad, Fəzi, Dağbəyi, 3 qızı – Zeynəb, Məleykə, Narın olmuşdur. Hacı Zeynalın karvansarasında qalarkən Məşədi Qasımın yaxın dostu Dəmirçi Məmmədqulunun razılığıynan Hacı Zeynalın oğlu Əşrəf bəylə sərkərdə Məşədi Qasımın qızı Məleykə xanım ailə qurmuşdular.

Artıq o vaxt gəlir ki, Azərbaycanda Sovet hakimiyyəti qurulur. Həmin vaxt Məşədi Qasımı Ağdam rayonuna milis rəisi vəzifəsinə qoymaq istəyirlər. Amma o buna razılıq vermir və böyük oğlu Sayadı o vəzifəyə məsləhət görür. Oğlu Sayad 3 ay Ağdamda milis rəisi vəzifəsində işlədikdən sonra o vaxtın milisinin qanunsuzluğunu başlıca şərt kimi əsas gətirərək oğlu Sayadı həmin vəzifədən azad etdirir və az müddətdən sonra sərkərdə Məşədi Qasım ermənilərlə döyüşdə aldığı ağır yaradan sonra Şuşada dünyasını dəyişir və Şuşa qəbirstanlığında dəfn olunur. Milyonlar kimi sərkərdə Məşədi Qasımın da ruhu müqəddəs göylərə pənah gətirib əbədiyyətə qovuşur.

Sərkərdə Məşədi Qasımın oğlu, el şairi Fəzi Kərimov yaxın illərə qədər Bərdə rayonununYeni Daşkənd kəndində yaşamışdır. Hal-hazırda Məşədi Qasımın 100-dən artıq nəvə-nəticəsi var. Onlardan Xuraman Kərimova, Sabir Kərimov, Savalan Kərimov, Zakir Kərimov, Azər Kərimov, Novruz Qasımov, Dilqəm Kərimov, nəticələri Naqif, Aqif, Qasım, Vurğun və Zaur, qız nəvələri Xasay Zeynalov, Səməd Babayev, Pərişan xanım Məşədi Qasımın davamçılarıdır.

Əlbəttə, böyük sərkərdə, xalqımızın qədirbilən, igid, cəsarətli oğlu Məşədi Qasım haqqında tədqiqata hələ bundan sonra böyük ehtiyac var. Ümidvaram ki, böyük tədqiqatçılarımız, ədəbiyyatçılarımız, tarixçilərimiz bu böyük şəxsiyyət haqqında daha dərinliklərə baş vuracaqlar, onu bütün Türk dünyasına olduğu kimi daha dəqiq tanıtdıracaqlar.

**Eldar Həsənli,**
***Azərbaycan Yazıçılar Birliyinin və***
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü,***
***«Ədalət» qəzeti, 25 may 2004-cü il***

## MƏŞƏDİ QASIM HAQQINDA

Oğuz yurdu Göyçə mahalının Daşkənd kəndində dövrünün şairəsi, sinədəftəri, el qədri bilən qeyrət timsalı qadınlarımız olmuşdur. Başxanım Şəfi qızı, Gülgəz Maqsud qızı (Qarabağlı qızı), Zərnişan Çıraqəli qızı, Kövsər Saleh qızı, Rəqiyə Fərrux qızı, Xuraman Fəzi qızı, Güləbatın (Qəriş) Şükür qızı və adını çəkmədiyim neçələri...

Görkəmli sərkərdə Məşədi Qasımın oğul, dərin dini biliyə malik Tağı oğlu Məhərrəmin isə qız nəvəsi olan Kərimova Xuraman Fəzi qızının sinəsi tarixi hadisələrlə, maraqlı əhvalatlarla, Aşıq Ələsgərin, atası şair Qəmgin Fəzinin, əmisi Həsən Xəyallının, bibisi oğlu Xasay Zeynalovun şeirləri ilə doludur. Bir dəfə adətim üzrə onun və həyat yoldaşı Vərqa müəllimin əhvalını soruşmaq, şirin söhbətlərinə qulaq asmaq üçün qonaqları idim. Həmin vaxt 77 yaşlı Xuraman xalanın özü bilmədən babası Məşədi Qasım haqqında danışdıqlarını səsyazma aparatında yazmışdım. Onu sizlərə də təqdim edirəm.

Andronikin Selikov adlı bir erməni generalı varıymış. Arpa, saman, ot yığar, vergi alar, camaatı talıyıb var-dövlətini aparırmış. Zoddan Səməd ağa hər kəndə xəbər verir ki, gəlin görək nə tədbir görürük. Qaraimandan Məşədi İsə, Şişqayadan Kor Tanrıverdi də daxil olmaqla ayrı kəndlərdən də adamlar gəlir. Daşkənddən yeddi nəfər – Hacı Rəhim, Məşədi Qasım, İdris, Ziyad, Kərbəlayi Zeynal, Nağı bəy bir də Tağı oğlu Məhərrəm gedir. Çox fikirləşirlər ki, neyniyək, nətəri edək. Kor Tanrıverdi deyir ki, barışıq edək. Məşədi İsəynən babam Məşədi Qasım deyirlər ki, barışıq bizə əl verməz, vuruşmaq lazımdır. Fikirləşirlər ki, Selikov gələndə heyvan kəsək. Yemək-içmək hazır olana qədər onu öldürək. Zoddan da Yusif adlı

bir oğlana tapança verirlər ki, biz gəzməyə çıxanda ondan aralaşacayıq sən onda Selikovu vurarsan.

Nəsə heyvanı kəsirlər. Selikova deyirlər ki, çıxaq bir az bağda gəzək, ona kimi də yemək hazır olar. Onlar bir az gedəndən sonra Səməd ağa Selikovdan aralanır. Bu vaxt Yusif ona güllə atır. Selikov ölmür, yaralanır. Silahı da əlindən düşür. Selikovda iki tapança varıymış. Əlini atıb belindən o biri silahı çıxarır və bir zodduyu vurub öldürür. Özünü tez yetirən Hacı Rəhim çətinliklə yaralanmış Selikovun başını kəsir. Zeynəb mamam, babamın bacısı Bahar danışırdılar ki, Selikovun başını Daşkəndə gətirəndə Nərimanlı kəndindən keçənə qədər eləcə arpa, arpa deyirmiş. Başı aparıb bizim kənddə çəkiblər, yarım pud gəlib. Kəndin itləri də onu yeməkdən imtina eliyiblər. Bundan sonra erməmlərə hay düşür deyirlər ki, türkləri qıracıyıq. Babam başının dəstəsiynən gedir Daşkənddə – Oyuqluda, bir də Səngər təpəsində səngər qazırlar, kəndi ermənidən qoruyurlar. Bu döyüşlərin birində ermənilər top atırlar. Top gəlib Məşədi babamın atını öldürür, özünün də üstünə torpaq tökülür, yaralanır. Bu vaxt düşmən də olsalar Qaçaq İdris deyir ki, Məşədi Qasım bizim bir düşmənimiz var o da ermənidir. Səni qoymaram burda qalasan. Onu öz atına mindirir və kəndə aparır. Bundan sonra babam Kəlbəcərdə müalicə olunub tez sağalır. Eşidir ki, Laçınlı Sultan bəy ermənilərnən döyüşür. Babam başının igidləriylə Kəlbəcərdən gedir Laçına, Sultan bəynən görüşür. Başlayır onnan bərabər ermənilərə qarşı döyüşməyə. Sonra babam Xocalıda yaşıyır, orda da qızdırmadan vəfat eliyir. Öz vəsiyyətinə görə Şuşada dəfn olunur. Məleykə bibimi də Qarabağda Əşrəf bəyə ərə verirlər. Allah hamısına rəhmət eləsin!

**Dinlədi: Araz Yaquboğlu**

# MƏŞƏDİ QASIM ƏSGƏRANDA

1918-1919-cu illərdə ana babam Məşədi Qasım (Hacı Kərim oğlu) və atamın əmisi oğlu Ziyad (Kərbəlayı Hacı oğlu) birlikdə Laçın, Şuşa və Əsgəran döyüşlərində iştirak ediblər. 14 gün Şuşanın Malıbəyli kəndində mühasirədə qalıblar. O vaxtı Sultan bəyin qardaşı, general-qubernator vəzifəsində işləyən Xosrov bəyin başçılıq etdiyi Azərbaycan əsgərlərinin köməkliyi ilə mühasirədən azad olublar. Babamgil Şuşalı Məmmədqulu, Laçınlı Sultan bəy, Ağdamlı Hacı Zeynalın çağırışı ilə o müharibədə iştirak ediblər. Çünki o zaman Göyçə ermənilər tərəfindən dağıdılmışdı.

Azərbaycanı xilas edən türk qoşunları Türkiyəyə qayıdan zaman Məşədi Qasım Hacı Kərim oğlunu Türk paşası Atatürkün razılığı ilə ən yüksək hərbi rütbə vermək, türk ordusunun sərdarı olmaq şərtiynən, dövlət hesabına təmin olunmaqla Türkiyəyə dəvət etmişdir. Anam danışardı ki, – Məşədi Qasım qəriblik sevmədiyinə görə bu təklifdən imtina etmişdir. Buna görə də Məşədi Qasımın adı əbədiləşsin deyə Ağdamın Qasımlı kəndi onun adına verilmiş və Xocalı kəndinin vergisi Məşədi Qasıma verilməsi qərarlaşdırılmışdır. Məşədi Qasımı sonra Ağdam rayon milis idarəsində vəzifəyə qoymaq istəyiblər, ancaq o vergidən də, bu vəzifədən də imtina etmişdir. Məşədi Qasımın oğlu Sayad sərrast atıcı olduğuna görə Ağdam rayon milis idarəsinə işə götürülmüşdür.

**Redaktordan:** Kitab çapa hazırlanarkən Məşədi Qasımın nəvəsi Səməd Əliyev uzaqda olduğundan və vaxtımızın da olmadığından onunla görüşüb ətraflı məlumat ala bilmədik. Bu yazını isə ondan 3-4 il öncə mənə bu haqda söyləyəndə qeydlər götürmüşdüm. Onu da deyim ki, Məşədi Qasım haqqında hal-hazırda onun qədər müfəssəl və doğru məlumata malik ikinci biri yoxdur. Onunla görüşüb fikirlərini mütləq dövri mətbuatda oxucalara çatdıracağıma söz verirəm.

# MƏŞƏDİ QASIM

Kitab nəşr edilib yaxın adamlara çatdırılan kimi Zakir Qəzənfəroğlu telefonla əlaqə yaradıb yanıma gəldi. Zakir müəllim Azərbaycan SSR Elmlər Akademiyasının xəbərləri (Tarix, fəlsəfə və hüquq seriyası) jurnalının 1989-cu ildə nəşr edilmiş 4-cü sayını da gətirmişdi.

Zakir dedi: – Daşkəndli Məşədi Qasım Hacı Kərim oğlu mənim babamdı. Bizim tayfamızın soy adı Kərim olub. Sovetlər dövründə Hacısını kənara qoyub cılxa «Kərimov» yazıblar. Sözüm ondadır ki, biz çox böyük humanistliklə Məşədi Qasıma qiymət verən, qədirşünaslıq eləyən Məşədisəyə rəhmət oxuyur, Zərzivilli Əmrah kişiyə də, sizə də alqış eləyib, cansağlığı diləyirik, bu söhbətin el içində yaşamağına da sevinirik!

Rəhmətlik Məşədisəyə verdiyiniz bu qiymətin örtülü tərəfindəki məna çox böyükdür. O zaman Məşədi Qasım və onun kimiləri əslində erməni faşizminə, erməni həyasızlığına, amansızlığına qarşı mübarizə aparıblar. Bunun sayəsində 1905-1907-ci illərdə Göyçədə kütləvi erməni basqınlarının, fəlakətlərinin qarşısı alınıb. Eləcə də, 1918-ci ildə ermənilər qəti plan hazırlayıblarmış ki, bütün kəndlərdə adamları xilas adı ilə damlara yığıb yandırsınlar. Buna bir neçə kənddə nail ola biliblər. Amma Məşədi Qasımın, Ələsgəroğlu Bəşirin, Qurbanoğlu Məmmədəlinin, Məşədi Cavoyun və bir çox belə igidlərin fəallığı sayəsində kəndlərin əksəri bu fəlakətə düçar olmayıblar. Var-dövlətləri qalsa da adamlar kəndlərdən salamat çıxa biliblər. Babam qaçqınçılıqdan sonra Azərbaycanda; xüsusilə Şuşada, Əsgəranda, Ağdamda da ermənilərə qarşı ciddi döyüşlərdə iştirak edib, yeri gəldikdə ermənilərin Göyçədə törətdikləri fəlakətlər barədə lazımi yerlərə, lazımi adamlara xəbərlər vermişdir.

Baxın, bu jurnalın 87-ci səhifəsində babam Məşədi Qasım həmkəndlisi Böyük Əli Hacı Mirzə Ələkbər oğlu ilə

birlikdə Azərbaycanda təzə qurulmuş hökumətin Daxili İşlər Nazirliyinə 23 yanvar 1919-cu ildə vurduğu teleqramda yazıb ki, Göyçədə ermənilər 22 kəndi (adbaad) görünməmiş amansızlıqla talan-qarət elədilər. 9 kəndin adamlarını damlara doldurub yandırdılar.

Yenə 11 mart 1919-cu ildə həmyerlisi Məhərrəmoğlu Abbasəli ilə birlikdə aləmə car çəkib lazımi yerlərə teleqram vurub bildirib ki, ermənilər kəndləri talan-qarət etməklə kifayətlənməmiş, ana-bacıları, qız-gəlinləri, hətta körpə uşaqları əsir aparıb işgəncələr vermişlər.

Babamın Ağdamda apardığı fəal mübarizəyə, göstərdiyi qəhrəmanlığa görə Sultan bəy Ağdam mahalında ona bir kənd bağışlamışdır. Kəndin adı Qasımlı kəndi qalmışdır.

Akademik Ziya Bünyadovun baş redaktor olduğu həmin jurnalın əvvəlində respublika ziyalılarının 15 avqust 1989-cu ildə Bakıda Aktyorlar Evində keçirdikləri toplanışda xalqa etdikləri müraciətdə deyilir:

«…Azərbaycan xalqının yeganə yolu bütün mənəvi, siyasi və fiziki qüvvələrini səfərbərliyə alıb, qara qüvvələrin fitnə toxumu səpməsinə qəti mane olmaq və buna son qoymaqdır. Dədə-babalarımızın bizə irs qalan mənəvi bütövlük, ləyaqət və torpaq qeyrəti, Vətən namusu çəkmək kimi yüksək keyfiyyətləri daim yaşatmalıyıq. Biz böyük imtahan qarşısında hər cür ayrıseçkiliyin, umu-küsünün, iddia və təkəbbürlülüyün üstündən adlayıb sarsılmaz bir qüvvəyə çevrilməliyik! Xalqımızın taleyi bunu tələb edir!..»

Bəli, bu gün də, sabah da taleyimiz, tərəqqimiz, həyatımız bundan asılıdır… Qoy bunu hamı bilsin, düşünsün, əməl eləsin!

**Əli Qurban Dastançı,**<br>
***«Məşədisə dastanı» kitabı,***<br>
***«Əbilov, Zeynalov və oğulları» nəşriyyatı,***<br>
***Bakı, 2000. səh.396-398***

## QƏHRƏMANLIQ MÜCƏSSƏMƏSİ
***(Kitabdan bir parça)***

…Dəli Alının məclisində Məşədi Qasım Aşıq Ələsgərə dedi: – "Lampa dibinə işıq salmaz".

Aşıq Ələsgər baxdı ki, Məşədi Qasım elə duruf, özünü elə cəmliyif, çəmliyif ki, heç elə bil o tənə söz ağzınnan çıxmayıbmış. İstədi bir də qalxsın, sazı köynəkdən sıyırsın, qalxmadı, baxdı ki, ikisinin də sambalına ziyan dəyər, «Baş sarıtel» çaldı, oxudu:

**Məşədi Qasım**

Sözün peyğəmbər sözüdü,
Sən pirənsən, Məşədi Qasım!
Məhəbbətlə könülləri
Sən hörənsən, Məşədi Qasım!

Qızılquştək tutdun bərə
Döndün pələngə, şirə!
Qüdrətinlə ürəklərə
Sən dönənsən, Məşədi Qasım!

Dosta mehrin, ülfətin var,
Düşmənnərə nifrətin var…
Əkdiklərin gətirib bar,
Sən ərənsən, Məşədi Qasım!

Nə gözəldi bu keşməkeş:
Teli dara, bığları eş!..
Dinsizləri yerə beş-beş
Sən sərənsən, Məşədi Qasım!

Dədə Ələsgərin yadında yaxşı qalmışdı, 1905-1907-ci illərdə erməni azğınlarına qarşı döyüşlərdə Məşədi Qasım hamıdan çox fərqlənmiş, hamıdan çox ad qazanmış, dilədişə düşmüşdü. Qarışıqlıq salanlara, şuluqluq törədənlərə qarşı mübarizədə fərqləndiyinə görə qlava Məşədisəyə «İgidliyə görə» qızıl medalını vermişdi. Məşədisə də haqqı unutmamış, gülüb demişdi ki, igidliyi Məşədi Qasım görsədir, qızıl medalı Məşədisə alır. Bu səda o zaman nə qədər sevindirmişdisə, indi də bir elə sevindirdi Ələsgəri. Ürəyində çaldığı sazını zilə çəkdi, dedi:

El uğrunda gərdin sinə,
Yağı qaşdı sinə-sinə.
Qismətini özgəsinə
Peşk edənsən, Məşədi Qasım!

Baxdı ki, Məşədi Qasım bərk xəyallanıb, gözləri keçən illərin o yanından bəri addıyıb gələcəyin neçə-neçə aşırımından aşıb o tərəfə. Elə bil ki, Məşədi Qasım onun dediklərini eşidir, eşitməsə də üzündən, gözlərindən oxuyur. Dedi:

Bilirsən, ay dövran bəyi,
Gedib nəyi, qalıb nəyi!..
Yüz illərnən gələcəyi
Görənsən, Məşədi Qasım!

**Əli Qurban Dastançı**
***«Qəhrəmanlıq mücəssəməsi»***
***(Dəli Alı Dastanı) kitabından***

# YURD YERİ
## *(Poemadan bir parça)*

### *1918-ci il Göyçəlilərin ikinci dəfə qaçqınlığı*

Sizə, bir aydınlıq verim əvvəlcə,
Birinci qaçqınlıq zamanı Göyçə.

Döyüşsüz, davasız təslim olmuşdu,
Ermənilər bu mahala dolmuşdu.

İkinci qaçqınlıq zamanı isə,
Güc-qüvvət gəlmişdi sanki hər kəsə.

İstər siyasətdə, istər döyüşdə,
Cəsarət var idi bütün hər işdə.

Mahalda hünərvər igidlər vardı,
Döyüşdə hər biri qalib olardı.

Ancaq arxa, kömək, silah yox idi,
Silahı işlədən süpah yox idi.

Silah işlədirdi tək-tək adamlar,
Azlıq eyləyirdi döyüşdə onlar.

Tüfənglər cütlülə, təklülə idi,
Atılacaq sursat bir güllə idi.

Ancaq ermənilər topla atırdı,
Bir atəşlə neçə nəfər yatırdı.

İngilis topuydu həmən bu toplar,
Çoxdan hazırlığa gəlmişdi onlar.

Ermənilər talayırdı kəndləri,
Od-atəşə qalayırdı kəndləri.

İki-üç gün qalırdılar kəndlərdə,
Kənd əhli qalırdı çox müsibətdə.

Taxıldan başlamış heyvana qədər,
Kərmədən, yappadan, samana qədər...

Tamam alırdılar varsa hər nəyi...
Müsəlmanın müzəmməti, gileyi.

Desələr də yetişmirdi bir yana,
Bircə dəfə girib ümid, gümana.

«Novobayazit Quberniyasına,
Daxili İşlər Nazirinin adına.

Qəzada yaşayan Daşkənd elindən,
Məşədi Qasımdan, Böyük Əlidən.

İyrim üçü yanvar, ili on doqquz,
Məktuba baxışlar hava kimi buz.

İş nömrə on səkkiz, dörddü şöbəsi,
Alsa da məktubu, çıxmadı səsi.

İndi də arxivdə durur ərizə,
Məzmunu açıqca bildirir bizə.

Talanıb Göyçənin iyrim üç kəndi,
Hər yandan bağlanıb bərəsi-bəndi.

Doqquz kəndi kül olunca yanıbdı,
Ellər sizi bir havadar sanıbdı.

Kömək edin bu davanı saxlayın,
Daşnakların niyyətini bağlayın.»

Oxucum, bu söhbət böyük söhbətdi,
Mənim hekayətim təkcə bir kənddi.

Bəzən məzmunumdan uzaqlaşsam da,
Vacib deyimləri yada salsam da.

Mən Daşkənd elindən söz açmalıyam,
Bu elin halından danışmalıyam.

Bu zaman Daşkəndli Məşədi Qasım,
Döyüşdə qeyizli Həzrət Abbasım.

Bir neçə qoçaqla səngər qurublar,
Erməniyi say-hesabsız qırıblar.

Hətta ermənidən top götürüblər,
Gavırlara çox hücumlar ediblər.

Düşmən olsalar da Qaçaq İdrislə,
Birliyə gəliblər ancaq bu işlə.

Nəzarət ediblər neçə səngərə,
İnam, cürət gəlib çox igidlərə.

Kərim oğlu Muxtar, Zorba Məhəmməd,
Tanrım edə kaş onlara min rəhmət!

Şücaət göstərib o döyüşlərdə,
Misilsiz olubdu Ziyad hünərdə.

Neçə ay beləcə döyüşlər gedib,
Arxasız igidlər yurdu tərk edib.

**Sərraf Şiruyə**
***"Göyçədən gələn səslər" kitabı,***
***Bakı, "Nurlan", 2008***

## AŞIQ NƏCƏF DASTANI
### *(ixtisarla)*[1]

Daşnaklar Göyçəyə atla dolanda,
Eşidir Zodlular elə o anda.

Səməd ağa xəbər verir hər kəndə,
Şişqayaya, Qaraymana, Daşkəndə.

Kəndlərə gedəndə Zoddan hər atlı,
Atları uçurmuş sanki qanadlı.

Atlılar gətirib xəbəri verdi,
Şişqayadan gəlir Kor Tanrıverdi.

Qaraymandan gəlir Məşədi İsə,
Sərraf qiymət versin yaxşıya, pisə.

Daşkənddən gəlibdi yeddi hünərvər,
Hacı Rəhim, Məşədi Qasım sərvər.

Kərbəlayi Zeynal, Ziyad, Nağı bəy,
Və İdris, Məhərrəm verməliymiş rəy.

Səməd ağa deyir: – "Gəlin bir görək,
Bütün el-obaya lazımdı kömək.

Hazır olanadək çay ilə xörək,
Məsləhət eyləyək, bir tədbir görək.

---

[1] Burada Xasay Zeynalovun "Aşıq Nəcəf dastanı"nın Məşədi Qasımla bağlı parçaları verilmişdir.

Ermənilər həddən artıq azıbdı,
Zəngəzurda xalqa quyu qazıbdı.

Türkü, azərini orda qırıbdı,
Kəndlərə od vurub tam yandırıbdı.

Üzünü tutubdu Göyçəyə sarı,
Deyirmiş quracam orada darı.

Deyirlər tutubdu Dərəçiçəyi,
Tonqalda yandırıb on ağbirçəyi.

Hər yerə göndərib neçə polkovnik,
Sulikov gələcək Zoda naçalnik.

Dözə bilməyibdi kədərə, dərdə,
Toğlucada Cığal olub sərkərdə.

Topal Oruc bir də Məşədi Hümbət
Silah almaq üçün xərcləyib sərvət.

Vətənin uğrunda çəkiblər əmək,
Heç yandan gəlməyib onlara kömək.

Onların taleyi tərsinə dönüb,
Toğlucada, Cildə ocaqlar sönüb.

Ayağı tutanlar didərgin olub,
Neçə gülbənizlər saralıb, solub.

Daşnaklar hücuma keçirmiş yüz-yüz,
Tutulub Ağqala, Nərədüz sözsüz.

Fikrinizi deyin görək
Qərarlaşaq, tədbir görək.

Tanrıverdi fikrə gedir,
Barışmagı təklif edir.

Məşədi İsə sözün deyib
Barışmağı sayır eyib.

Məşədi Qasım isə deyir,
Barışıq bizə verməz xeyir.

Təklif edir vuruşmağı
İnkar edir barışmağı.

Andronik tökür qanı,
Xalqa eləyir divanı.

Sona yetsə də ömrümüz,
Bir olmalıdı sözümüz.

Silahlanaq biz gərək,
Niyə ona bac verək...

Budur bizim son sözümüz,
Qoruyaq Vətəni özümüz."

Sulikov özünü Zoda yetirir
Səməd ağa onu "qonaq" gətirir.

Deyir: – Gəlin gəzək bu çəmənzarda,
Camaat dayansın bir az kənarda.

Camaat eşidir Səməd ağanı,
Daxildə kədəri didir dığanı.

Səməd ağa susub plan qururmuş,
Sulikov da "Arpa" deyib dururmuş.

Bir qədər bərabər gəzirlər onda,
Gedələr yeməyə hazır olanda.

Çiçəkli çəməndə, güllü düzəndə,
Yanaşı danışıb, qoşa gəzəndə.

Səməd ağa onun yanında durur,
Sulikovu Yusif qəflətən vurur.

Sulikovda iki tapança varmış,
Birini həmişə əldə tutarmış.

Birini kəmərdən gizli asarmış,
Ehtiyatda çətin günə saxlarmış.

Camaat kənarda baxıb duranda,
Zodlu Yusif Sulikovu vuranda.

Sulikov yıxılır, qaşı çatılır
Əlindəki silah yerə atılır.

Əlini ataraq gizli naqana
Baxmır yarasından axan al qana.

Atır tapançadan bir Zodlu vurur
Arpa! Arpa! – deyib, bağırıb durur.

Daşnaklar kənardan ona baxanda
Sulikovun qanı yerə axanda.

Hacı Rəhim onun başını kəsir
Daşnaklar qorxudan titrəyir, əsir.

Aparanda kəsik başı Daşkəndə
Daşkəndlilər Nərimanlıdan keçəndə.

Yolda kəsik başda dil tərpənirmiş
Ara-sıra Arpa! Arpa! deyirmiş.

Daşnak atlıları Zoddan dağılır
Qızılbulaq adlı kəndə yığılır.

***

...On doqquzuncu ildə on beş apreldə,
Daşkənd adlı kənddə, o gözəl eldə.

Məşədi Qasım, İdris göstərdilər səy,
Ziyad da gələrək, oldular həmrəy.

Hər üçü səngərdə mərd kimi durdu,
Daşnak dəstəsinə həmlələr vurdu.

Bir də Koralların qoçaq Vəlisi,
Vətənin dörd oğlu, mərdi, xalisi.

Hər dağda, təpədə səngər qazdılar,
Düşmənin səfini tamam pozdular.

Daşnaklar bu zaman çaş-baş qaldılar,
Gedib ingilisdən toplar aldılar.

Göyçə mahalını etdilər talan,
Qaçırdı mahaldan salamat qalan.

Tərsə dağlarından yallar aşdılar,
Didərgin düşdülər gözü yaşlılar.

Çatır polkovnikə zəfər müjdəsi,
Hər yana yayılır sədası, səsi.

Düşmən üstünlüyü alanda ələ,
Dörd igid vuruşur durmadan hələ.

Atırlar hədəfə əsər etməyir,
Ara uzaq olur, güllə yetməyir.

Mərd igidlər mat-məəttəl qalırlar,
Məyus olub, qəm, kədərə dalırlar.

Düşmənlər atırlar torpaq sovrulur,
Tərslikdən hava da qar-boran olur.

Döyüş davam edir, səngimir hələ,
Qasımın atını öldürür güllə.

İdris öz atını verir Məşədiyə,
Gedir Kəlbəcərə, çatır Bəyliyə.

Şahiddir "Oyuqlu", "Səngər təpəsi"
Tapılıb oradan topun gülləsi.

Göyçə hadisəsi olubdu belə,
O dörd igid həyan olub bir elə.

Göyçəlilər o yalları aşanda,
Tənginəfəs, boran vurub çaşanda.

Dünyasın dəyişib yaşlı qocalar,
Yolda tələf olub çox balacalar.

Məşədi Bəyliyə çatan zamanda,
Bir neçə ər, igid varmış yanında.

Sultan bəy davaya hazırlaşırmış,
Daşnak ordusuyla qarşılaşırmış.

Gedib Sultan bəylə o söhbət edir,
Laçın davasında iştirak edir.

Oxucum, oxusan şübhəni burax,
İnanmasan Tiflis arxivinə bax.

Məşədi davada çox sərrast atır,
Onun igidliyi qəlblərə yatır.

Andronik canını qurtarıb qaçır,
Düşmən məhv edilir, günəş nur saçır.

Ara sakitləşir, qurtarır dava,
Buludlar çəkilir, açılır hava.

Məşədi Qasımın artır hörməti,
Sultan bəy igidə verir xələti.

Deyir ki, layiqsən mərd igidliyə,
Xocalı kəndini edir hədiyyə.

Bir müddət yaşayır qürbət məkanda,
Unutmur vətəni, inan, bir an da.

Doğma yurd həsrəti qəddini əyir,
Xocalı kəndində vəfat eyləyir.

Öyrənmişəm hadisəni babamdan,
Deyirdi ki, bunlar çıxmaz yadımdan.

Bir də eşitmişəm yaşlı adamdan,
Qonşumuz, Gülməmməd oğlu İslamdan.

Eşitmişəm bir də Molla Abuzərdən,
Gözüylə gördüyü hadisələrdən.

Babam bu mövzuda hey danışardı,
Nəcəfi yad edib hərdən çaşardı.

Deyirdi ocaqlar yandı, qaraldı
Ata-baba yurdu daşnağa qaldı.

Səxavətli ellər düşdü çöllərə,
İgidlərin adı düşdü dillərə.

Ağbirçək analar ağılar dedi,
Vətən həsrətindən qəm-kədər yedi.

Ah-aman eylədi, qəmlərə daldı,
Gülüzlü cavanlar vaxtsız qocaldı.

Belədir həqiqət düzünü desək,
Arayıb, axtarıb yazmışam gerçək.

Sadə insanların günahı yoxdur,
Androniklərin təqsiri çoxdur.

Oxucum, oxuyun, bilin bunları,
Öyrənin keçmişdə bu olanları.

Xasayam, bunları yazdım sərbəsər,
Nəcəfin sözlərin eyləyin əzbər.

Yadıma düşəndə dəyişir halım,
Məkanım Daşkənddi, Göyçə mahalım.

**Xasay Zeynalov**
***"Göyçəsiz günlərim" kitabı,***
***Bakı, "Nurlan", 2006.***

## ADI DASTANLAŞAN EL QƏHRƏMANI

*“Türkü öldürmək olar, onu məğlub etmək olmaz”*
**Napoleon**

Göyçə mahalının ayrı-ayrı kəndlərindən olan igid el qəhrəmanları 1905-1907 və 1918-1919-cu illərdə erməni işğalçılarına qarşı mərdliklə döyüşmüşlər. Ardanışdan Məşədi Hümbət, Ağbulaqdan Dəli İsmayıl, Qaraimandan Məşədi İsə, Ağkilsədən Bəşir, Toğlucadan Cığal Həsən, Şişqayadan Kor Tanrıverdi, Zoddan Səməd ağa və neçə-neçə belə ərənlər... Daşkənd kəndindən də həmin illərdə igidlik göstərənlər az olmamışdır – Hacı Rəhim, Məşədi Qasım, Qaçaq İdris, Mədət Qocamanoğlu, Kərbəlayı Zeynal, Əliş Süleymanov, Vəli, Koroğlu Məhəmməd, Ziyad Babayev, Nağı bəy, Tağı oğlu Məhərrəm, Hacı Dünyamalı oğlu Abbasəli və başqaları.

Tarixi mənbələrə, sənədlərə və real söyləmələrə əsaslanan bu araşdırmamız dövrünün cəsur igidlərindən olan Rəsulov Məşədi Qasım Hacı Kərim oğlu haqqındadır. Məşədi Qasım 1863-cü ildə Göyçə mahalının Daşkənd kəndində Rəsullular nəslində anadan olub. O, Göyçə mahalında çox hörmətli, adlı-sanlı şəxsiyyətlərdən biri, eyni zamanda erməni daşnaklarının hücumlarına qarşı xalqı səfərbər edən başbilən kişilərdən olmuşdur. Məşədi Qasım Ceyran xanımla ailə həyatı qurmuş, onların Hüsən, Zeynəb, Məleykə, Sayad, Narın, Dağbəyi və Fəzi adında 4 oğlu, 3 qızı olmuşdur.

Məşədi Qasım Zodlu Səməd ağa, Şişqayalı Kor Tanrıverdi, Məşədi Allahverdi, Çaxırlı Böyük ağa, Qaraimanlı Məşədi İsə, Qanlılı Hacı Nağı və dahi aşığımız Ağkilsəli Aşıq Ələsgər ilə yaxın dostluq etmişdir. Aşıq Ələsgərlə dostluğu barədə aşığın nəvəsi İslam Ələsgər “Haqq aşığı

Ələsgər" kitabında[1] da məlumat vermişdir. Sonralar Məşədi Qasımın oğlu Sayad (1905-1955) Alməmmədlər nəslindən evlənmişdir. Məşədi Qasımın digər oğlu, el şairi Qəmgin Fəzi (1914-2000) Aşıq Ələsgər ocağı ilə, xüsusən də Aşıq Nəcəf, Aşıq Talıb, Aşıq Musa və Bilal Məmmədovla ömrünün sonunacan dostluq etmiş, səmimi münasibətdə olmuşdur.

Belə söyləyirlər ki, sovetləşmədən qabaq Məşədi Qasım adam vurubmuş. O dövrün qanunlarına görə bir il həbs cəzası çəkməliymiş. Qaydalara uyğun istənilən adam başqasının əvəzinə cəza çəkə bilərmiş (Bəlkə də Kərbəlayı Əmrah cinayəti öz üzərinə götürüb – A.Y.). Kərbəlayı Əmrah özündən kiçik qardaşı Məşədi Qasımın əvəzinə bir il "katorqa" çəkib. Deyib ki, sən igidsən, qoçaqsan, arxa-dayaqsan, mən sənin əvəzinə tutularam, amma səni qoymaram tutalar.[2]

Türkün qanına susayan ermənilər Göyçə mahalında daha da azğınlaşmışdılar. "1919-cu il yanvarın 24-də Göyçənin Çamırlı kəndinə basqın edən daşnak terrorçuları dörd kişinin başını, altı qadının döşlərini kəsərək on nəfər dinc sakini vəhşicəsinə qətlə yetirmişlər."[3] Məşədi Qasım bu hadisəni eşidir və düşünür ki, onlar kəndləri yandıra-yandıra, əhalini vəhşicəsinə öldürə-öldürə bir gün də gəlib Daşkəndə çıxacaqlar. Ona görə də özünün təşəbbüsü və başçılığı ilə kənddən Qaçaq İdrislə, Hacı Rəhimlə, Qocamanoğlu Mədətlə, Kərbəlayı Zeynalla, Əliş Süleymanovla və Ziyad Babayevlə birlikdə Göyçə gölünün cənubundakı Çamırlı və ətraf kəndlərin köməyinə getmiş-

[1] İslam Ələsgər "Haqq aşığı Ələsgər", Bakı, "Maarif", 1999. səh.42.
[2] Söyləyəni: Əmrahov Haris Məhəmməd oğlu (76 yaş)
[3] Əlisahib Əroğul. "Erməni-daşnaq faşizmi və Azərbaycan". Bakı, "Təhsil", 2007.

dir. Hətta Çamırlı kəndində gedən döyüşdə Süleymanov Əliş Sevdalı Hüseyn oğlu şəhid olur. Babası Kərbəlayı Zeynaldan eşidib-öyrəndiyi bu hadisələri tarixçi-müəllim Xasay Zeynalov şəxsən bu sətirlərin müəllifinə danışmışdır. Əziz Ələkbərli də bu barədə doğru olaraq yazır: "1918-1919-cu illərdə bu ərazidə (Göyçə mahalı nəzərdə tutulur – A.Y.) erməni daşnaklarının hücumlarına qarşı xalqı səfərbər edən igid oğullardan biri də Daşkənd kəndindən Məşədi Qasım Hacı Kərim oğlu olmuşdur."[1]

Tam olmasa da, araşdırma və tədqiqatlarımız zamanı bəzi mənbələrdə bir neçə məlumatlara rast gəldik. Əli Qurban Dastançı "Məşədisə dastanı" kitabında Zərzibilli Əmrah kişinin söylədiklərinə əsasən yazır: "1906-cı ildə Bayaziddə Qlava Məşədi İsəyə həmən illərdə qarışıxlıq salanlara qarşı yaxşı mübarizə apardığına görə "Qızıl medal" veriləndə gülüb, deyib ki, hünəri Daşkəndli Məşədi Qasım göstərib, medalı, özü də qızıl medalı Qaraimanlı Qlava Məşədi İsə alır... Yəni ki, hünər səninkidi, ad mənimkidi...".[2] Həmin yazıda müəllif bir daha qeyd edir ki, "Məşədi İsənin Məşədi Qasım haqqında dediyini bir neçə il əvvəl Bərdənin Yeni Daşkənd kəndində müdrik ağsaqqal olan Abbasəli kişidən ətraflı eşitmişdim".

Görkəmli alimimiz, akademik Ziya Bünyadovun baş redaktoru olduğu "Azərbaycan SSR EA Xəbərləri" jurnalında ermənilərin Azərbaycan xalqına qarşı 1918-1919-cu illərdəki etdiyi zorakılıqlardan bəhs edən "Ermənilər və Ermənistan Respublikası qoşunlarının Qarabağın və Gəncə quberniyası, İrəvan quberniyası ilə həmsərhəd qəzaların

[1] Əziz Ələkbərli, "Qədim türk-oğuz yurdu "Ermənistan"", Bakı, "Sabah", 1994. səh. 174.

[2] Əli Qurban Dastançı, "Məşədisə dastanı", Bakı, "Əbilov, Zeynalov və oğulları", 2000. səh. 216.

müsəlman əhalisinə qarşı törətdikləri zorakılıqlar barədə Daxili İşlər Naziliyi dəftərxanasının işlərindən çıxarış (80 saylı işdən – 1918-ci il, IV şöbə)" ümumi başlıqlı 53 bənddən ibarət raport, ərizə, teleqram və xahişnamələrdən 19, 51, 52-ci hissələrdən oxuyuruq:[1]

"***19. İrəvan Quberniyası Yenibəyazit qəzası Daşkənd kənd sakinləri Məşədi Qasım Hacı Kərim oğlu və Böyük Əli Hacı Mirzə Ələkbər oğlunun Daxili İşlər Nazirinin adına 23 yanvar 1919-cu il tarixli xahişnaməsi.***

Erməni hökuməti qoşunlarla məmur qismində müsəlman kəndlərinin sakinlərini tamamilə talan etdi: – 1)Zağalı, 2)Daşkənd, 3)Zod, 4)Hüseynquluağalı, 5)Sarıyaqub, 6)Böyük Qaraqoyunlu, 7)Kiçik Qaraqoyunlu, 8)Aşağı Narçamor, 9)Yeni Keti, 10)Qayabaşı, 11)Qoşabulaq, 12)As-Kdisa, 13)Zərzibil, 14)İnəkdağı, 15)Sultanəliqışlağı, 16)Oğruca, 17)Böyük Məzrə, 18)Bala Məzrə, 19)Kəsəmən, 20)Şişqaya, 21)Sətənəxaç, 22)Qızıl-Payka. Qoşunlar hər kənddə 5-6 gün qalırlar. Talan etdikdən sonra çıxıb başqa kəndə gedirlər.

Aşağıdakı kəndləri tamamilə yandırmışlar: 1)Örkülü, 2)Alçalı, 3)Kəminli, 4)Yarpızlı, 5)Qanlı, 6)Kərkibaş, 7)Çaxırlı, 8)Kefli-Kürdü və 9)Böyük Məzrə. (18 saylı iş, 1919-cu il, IV şöbə)

***51. Gəncə Qubernatorunun 11 mart 1919-cu il tarixli 352 saylı teleqramı:***

Yenibəyazit qəzasının Daşkənd, Şorca, Nevksiti, Sarıyaqub, Qaraqoyunlu, Oğruca, Qayabaşı və Qoşabulaq kəndlərinin nümayəndələri Məşədi Qasım, Abbasəli (Hacı Dünyamalı oğlu – A.Y.), Məhərrəm Tağı oğlu bildirirlər ki, erməni qoşunları onları mütamadi olaraq talan edir, bütün

[1] Azərbaycan SSR Elmlər Akademiyasının xəbərləri (tarix, fəlsəfə və hüqüq seriyası) №4, Bakı, «Elm», 1989. səh.87. (baş redaktor: Ziya Bünyadov)

taxılı, yemi, mal-qaranı, silahı götürmüşlər; özləri ilə çoxlu insanlar aparmışlar, onların taleyi məlum deyil.

***52. İrəvan Quberniyası Yenibəyazit qəzası Göyçə mahalının 26 kənd sakininin həmin il 2 mart tarixli ərizəsi Gəncə Qubernatoru tərəfindən 6 mart 1919-cu ildə 3162 sayla təqdim edilmişdir.***

1919-cu il fevralın 28-də romistr Silikov, kornet Xaçaturov və adyutantın dəstəsi müsəlman kəndlərinə gəldi və hər kənddən 750 pud taxıl və 100 pud quru ot tələb etdi; həmin şeylər bu miqdarda olmadığından xalq mükəlləfiyyətdən azad edilməyi xahiş etdi; bu zaman Silikov qamçı ilə vurmağa və söyməyə başladı və hətta Zod kəndinin sakini Məci Süleyman oğlunu öldürdü, qalan zabitlər isə daha dörd müsəlmanı yaraladılar. Təlaşlanmış xalq hücum edib dörd zabiti və on beş əsgəri öldürdü, bu Zod kəndində olmuşdu.

Martın 2-də ermənilər Qoşabulaq, Daşkənd və Böyük Məzrə kəndlərini ələ keçirməyə çalışdılar, lakin hələlik dəf edildilər."

Sənədlərdən də görünür ki, Məşədi Qasım, Böyük Əli Hacı Mirzə Ələkbər oğlu, Hacı Dünyamalı oğlu Abbasəli, Tağı oğlu Məhərrəm və digərləri böyük fədakarlıq göstərmiş, ermənilərə qarşı döyüşməklə yanaşı, Azərbaycan hökumətini də bu zorakılıqlardan hali etmişlər. 1919-cu il aprelin 20-də artıq Göyçə mahalının Kəlbəcərlə qonşu olan kəndləri, eləcə də Daşkənd kəndi işğal edilmişdir.

Məşədi Qasım Göyçə mahalındakı döyüşlərdən sonra ailəsi ilə birlikdə Qarabağa gəlmiş, Laçınlı Sultan bəyin silahdaşı olmuş və erməni millətçilərinə qarşı qəhrəmanlıqla vuruşmuşdur. Laçınlı Sultan bəylə Məşədi Qasımın tanışlığı Göyçənin ağır günlərində Sultan bəy Göyçəyə – Basarkeçərə, Zoda köməyə gələrkən olmuşdur. Məşədi

Qasımda ermənilərə qarşı qisasçılıq istəyi və Sultan bəyin də ermənilərə qarşı apardığı mübarizə Məşədi Qasımın Qarabağa gəlməsinə səbəb olmuşdur. O, sərrast atıcı kimi 1919-cu ildə Qarabağda baş verən hadisələrdə xüsusən fəallıq göstərmişdir. Bir il Sultan bəy və qardaşı Xosrov bəyin məsləhəti ilə kəndin vergisi də ona verilməklə Xocalı ətrafında bir kənddə (deyilənlərə görə Ağdamın Qasımlı kəndi) yaşamışdır. 1921-ci ildə Məşədi Qasım orada qızdırmadan vəfat etmişdir və dostu Məmmədquluya etdiyi vəsiyyətinə əməl olunaraq Şuşa şəhərində dəfn olunmuşdur. Məşədi Qasımın vəfatından sonra qardaşı Kərbəlayı Əmrah Qarabağa gələrək onun uşaqlarını doğma ata-baba yurdları Göyçəyə aparmışdır.

Məşədi Qasımın həyat-fəaliyyəti haqqında dövri mətbuatda və kitablarda çox yazılmışdır. Onun haqqında hesab edirik ki, ən müfəssəl, doğru məlumatları nəvəsi Xasay Zeynalov "Göyçə mahalında 1917-1920-ci illərin hadisələri" məqaləsində[1] yazmışdır. Daha iri həcmli məqalə isə Eldar Həsənlinin "Göyçəli sərkərdə Məşədi Qasımın Əsgəran döyüşü" adlı məqaləsidir.[2] Lakin müəllif məqalədəki məlumatlarda bəzi təhriflərə yol vermişdir.

Məşədi Qasımın XX əsrin əvvələrində ermənilərə qarşı apardığı mübarizəni həmin əsrin sonlarında onlarla nəvə-nəticələri də davam etdirdilər. Onlardan nəvəsi Yasif, nəticələri Abbas və Nəbi Qarabağ döyüşlərində şəhidlik zirvəsinə ucaldılar.

**Araz Yaquboğlu,**
***tədqiqatçı***

---

[1] Xasay Zeynalov, "Göyçəsiz günlərim", Bakı, "Nurlan", 2006.
[2] Eldar Həsənli, "Göyçəli sərkərdə Məşədi Qasımın Əsgəran döyüşü", "Ədalət" qəzeti, 25 may 2004-cü il.

***Hörmətli oxucular! Kitabın sonunda ulu sərkərdə Məşədi Qasımın layiqli nəvəsi – silahı ilə deyil, siyasəti, elmi fəaliyyəti, qələmi ilə ermənilərə qarşı mübarizə aparan dəyərli ziyalımız, professor Azər Kərimov haqqında yazdığım "Kəndimizin ilk professoru" adlı məqaləni burada verməyi özümə mənəvi borc bildim.***

Kərimov Azər Fəzi oğlu 29 dekabr 1951-ci ildə Qərbi Azərbaycanın Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində el şairi Qəmgin Fəzinin ailəsində anadan olub. 1953-cü ildə ermənilərin mənfur siyasəti nəticəsində doğma yurddan ailəsi ilə birlikdə Bərdə rayonuna deportasiya olunmuşdur.

1968-ci ildə Bərdə rayonu Yeni Daşkənd kənd orta məktəbini bitirmişdir.

1968-ci ildə Azərbaycan Politexnik İnstitutunun İnşaat fakültəsinə qəbul olmuş və 1973-cü ildə həmin institutun tikintinin iqtisadiyyatı ixtisasını fərqlənmə diplomu ilə bitirmiş, təhsil aldığı institututda müəllim vəzifəsini tutması məsləhət görülmüşdür.

Moskvada aspiranturada təhsil aldıqdan sonra dissertasiya işini müdafiə edərək elmlər namizədi adını alıb. Və Bakıya qayıdaraq pedaqoji fəaliyyətini davam etdirib. Səmərəli müəllimlik fəaliyyətinə görə Ümumittifaq Ali Attestasiya Komissiyası tərəfindən dosent elmi vəzifəsinə layiq görülüb. Moskvada elmi işinin nəticələrinin tətbiq olunması üzrə "Elm texnika" sahəsində Azərbaycan SSR Lenin Komsomolu mükafatına layiq görülmüşdür. Qeyd edək ki, bu mükafata institutut müəllimi kimi layiq görülən yeganə ziyalıdır.

Azər Kərimovun elmi işinin əhəmiyyəti hələ sovetlər dönəmində xaricilərin marağını cəlb edib və 1985-1987-ci illərdə Moskva şəhərində xarici dil kursu keçdikdən sonra

1987-ci ildə Azərbaycan SSR Təhsil Nazirliyi və Xarici İşlər Nazirliyinin təqdimatı ilə müsabiqədə 20 nəfər namizəd arasında qalib gələrək pedaqoji fəaliyyətini davam etdirmək üçün Çexoslovakiyaya göndərilib. Slovakiya Texniki Universitetinin rektoru, tanınmış elm xadimi Anton Blaje onun sənədlərinin qəbul olunmasına xüsusi diqqət ayırıb. Ona ayrılan vaxtın başa çatmasına baxmayaraq Çexoslovakiya Texniki Universitetinin rəhbərliyi SSRİ tərəfinə Azər Kərimovun daha bir-neçə il bu ölkədə qalması xahişi ilə müraciət edib.

1994-cü ildə Slovakiyada doktorluq dissertasiyasını müdafiə etmiş, texnika elmləri doktoru alimlik adını almışdır. Bundan altı ay müddətində pedaqoji və elmi fəaliyyətinə, nəşr etdirdiyi kitablara, metodiki göstərişlərə görə professor vəzifəsinə layiq görülmüşdür. Hazırda Çexiya Universitetlərində dərs deyən yeganə azərbaycanlı professordur.

O, 20 ildən çoxdur ki, (1990-cı ildən) Avropada – Çexiya Respublikasında 119 ildən artıq tarixi olan qədim elm ocağı Moraviya Texniki Universitetində professor doktor kimi müəllimlik fəaliyyəti ilə məşğuldur. Azərbaycan Respublikası Təhsil Nazirliyi və Xarici İşlər Nazirliyindən müsabiqə yolu ilə Avropaya göndərilən professor Azər Kərimov dövlətimizi, xalqımızı, elmimizi, milli-mənəvi dəyərlərimizi Avropada layiqincə təmsil etməklə bərabər son iki ildə ona daha böyük etimad göstərilmiş, Moraviya təhsili, akademik senatı tərəfindən MDB dövlətləri üzrə koordinator vəzifəsinə seçilmişdir. Onun Azərbaycan Respublikası Beynəlxalq Diaspora Mərkəzinin Avropa nümayəndəliyinin rəhbəri kimi dünya məkanında, Avropa dövlətlərində Azərbaycan diasporunun, lobbizmin möhkəmlənməsi, inkişaf etdirilməsi, soydaşlarımızın torpağa

sədaqət, Vətənə xidmət naminə bir bayraq altında həmrəy olmaq işindəki xidmətləri də təqdirəlayiqdir. Professor Azər Kərimov Vətənimizin problemlərini, ermənilərin işğalçılıq siyasətini dünya ölkələrinin nəzərinə çatdırmaqla böyük ictimai-siyasi fəallıq göstərir. Geniş elmi və ictimai-siyasi fəaliyyətlə məşğul olub ölkəmizlə bağlı həqiqətləri dünya ictimaiyyətinə çatdırır. Bu, ümummilli liderimiz mərhum prezident Heydər Əliyevin – "Vətən birdir və hər bir azərbaycanlı bu vətənə xidmət etməlidir" tövsiyəsinin əməli nəticəsi kimi qiymətləndirilməlidir. Onun altı dildə sərbəst danışması da təqdirəlayiq haldır. Çünki avropalı ilə onun öz dilində danışmağın əhəmiyyəti danılmaz reallıqdır.

Dövri mətbuatda mütəmadi məqalələri çap olunan professor Azər Kərimovun səyi və rəhbərliyi nəticəsində 1998-ci ildə Moraviya Texniki Universitetinin nəzdində Çex-Azərbaycan Mədəniyyət Mərkəzi yaradılmışdır. Burada çex, macar, rus, polyak, belarus, ukraynalı alimlər tədqiqat işləri aparır, elmi məqalələr yazır və problemləri birgə həll edirlər.

Azər Kərimovun səyi nəticəsində ənənəvi olaraq tanınmış şərqşünaslar, alimlər, siyasətçilər Azərbaycanda səfərdə olmuş, Azərbaycan mədəniyyəti və tarixi ilə yaxından tanış olmuşlar. Bunlardan çexiyalı professorlar İvan Meznik və Frantişek Çapkanı xüsusilə qeyd etmək olar.

Professor A.F.Kərimov xaricdə yaşayan bir alim, elm adamı kimi 2001-ci il 9 noyabrdan keçirilməyə başlayan Dünya azərbaycanlılarının Qurultayının daimi iştirakçısıdır.

**Araz Yaquboğlu**

# İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYAT

**1.** Azərbaycan SSR Elmlər Akademiyasının xəbərləri (tarix, fəlsəfə və hüqüq seriyası) №4, Bakı, «Elm», 1989. (baş redaktor: **Ziya Bünyadov**)
**2. Azər Kərimov,** "Kimə deyim fəryadımı", "Vətən səsi" qəzeti, №11(47). 14 mart 1991-ci il.
**3. Amalya Qasımova,** "Yollara boylanma, ana!", "Yeni Samux" qəzeti, №01(01), 22 iyul 1992-ci il.
**4. Hidayət Hacıyev,** "Ömrün zirvəsi şəhidlikdir", «Ədalət» qəzeti, 8 sentyabr 1992-ci il.
**5. Azər Kərimov,** "Əsgər sülaləsi" (Atamla söhbət), "Azərbaycan" qəzeti, 15 oktyabr 1992-ci il.
**6. Azər Kərimov,** "Son görüş", "Aydınlıq" qəzeti, №13(142). 19 mart 1993-cü il.
**7. Sənubər Məmmədova,** "Dərd üstündən dərd", "And" qəzeti, №10(22). 19 mart 1993-cü il.
**8. Azər Fəzi,** "Vətən məni yetişdirib...", "Vətən səsi" qəzeti, 7 may 1993-cü il.
**9. Əziz Ələkbərli,** "Qədim türk-oğuz yurdu "Ermənistan"", Bakı, "Sabah", 1994. səh. 174.
**10. Xasay Zeynalov,** "Kəpəz ona lay-lay deyir", "Sərhəd" qəzeti, 27 iyul 1994-cü il.
**11. Sərraf Şiruyə,** "Ağlama bülbül, ağlama", Gəncə, 1994. səh.304-324.
**12.** "Samux şəhidləri", (tərtib edəni: **Amalya Qasımova**), Bakı, "Önər", 1995.
**13. Qədir Aslan.** "Göyçə şəhidləri", Bakı, "İşıq", 1997.
**14. İslam Ələsgər,** "Haqq aşığı Ələsgər", Bakı, "Maarif", 1999. səh.42.

**15. Əli Qurban Dastançı,** "Məşədi Qasım", "Məşədisə dastanı" kitabı, Bakı, "Əbilov, Zeynalov və oğulları", 2000.
**16. Azərbaycan Respublikası Xatirə Kitabı,** III cild, Q hərfi, Respublika Xatirə Kitabı Redaksiyası, Bakı, 2001.
**17. Eldar Həsənli,** "Göyçəli sərkərdə Məşədi Qasımın Əsgəran döyüşü", "Ədalət" qəzeti, 25 may 2004-cü il.
**18. Mir Cəfər,** "Bərdə şəhidləri", Bakı, "Sabah", 2005. səh.128-129.
**19. Əli Qurban Dastançı,** "İki Məşədi Qasım", "Qəhrəmanlıq mücəssəməsi (Dəli Alı dastanı)" kitabı,
**20. Xasay Zeynalov,** "Göyçəsiz günlərim", Bakı, "Nurlan", 2006.
**21. Səyyad Şairov,** "Yaralı Göyçə", Bakı, "Nurlan", 2006.
**22. Azərbaycan Respublikası Xatirə Kitabı**, VII cild, K, Q (Q...-Qaz.) hərfləri, Respublika Xatirə Kitabı Redaksiyası, Bakı, 2007.
**23. Qocaman Qocamanov,** "Göyçə mahalında, Daşkənd elində", Bakı, "Nurlan", 2007.
**24. Zülfiyyə Şiruyəqızı,** "Mən bir sınmış budağam", Bakı, "Nurlan", 2007. səh.45.
**25. Fərqanə Mehrabova**, "Elin cəsur oğlu" "Respublika gəncləri" qəzeti, №9(265). 18 mart 2008-ci il.
**26. Araz Yaquboğlu**, "Daşkənd aşıqları və şairləri", Bakı, "Nurlan", 2008.
**27. Sərraf Şiruyə,** "Seçilmiş əsərləri" II cild, Bakı, "Nurlan", 2008. səh.303-329.
**28. Sərraf Şiruyə,** "Göyçədən gələn səslər", Bakı, "Nurlan", 2008.
**29. Xasay Zeynalov,** "Vətən həsrətində, el firqətində", Bakı, "Hərbi Nəşriyyat", 2009.

**30. Füzuli Ramazanoğlu.** “Bu da bir taledir”, Bakı, «Nurlan», 2009.
**31. Azərbaycan Respublikası Xatirə Kitabı,** IX cild, M(M...-Məmmədov L.), Respublika Xatirə Kitabı Redaksiyası, Bakı, 2009. səh.256.
**32. Aqşin Hacızadə,** “Tanrı bizi bağışlamaz”, Bakı, “Elm və təhsil”, 2010. səh.33.
**33. Sənubər Fəziqızı**, “Şəhid olmaq istəyirəm, ay ana!” “Press-Media” qəzeti, №13(137). 26 fevral 2010-cu il.
**34. Kənan Məmmədov**, “Şəhid ruhu yad edildi” (“Biz şəhid olduq ki, vətən yaşasın”). “Press-Media” qəzeti, №14(138). 12 aprel 2010-cu il.
**35. Fərqanə Nürəddinqızı,** “Onlar şəhidlik zirvəsinə ucaldılar”. “Göyçənin səsi” qəzeti, №1 (01). 11 aprel 2011-ci il.
**36. Azərbaycan Respublikası Xatirə Kitabı,** XI cild, “Respublika Xatirə Kitabı Redaksiyası”. Bakı, 2011. səh.641-647.
**37. Araz Yaquboğlu,** “Laçın vüqarlı Yasif”, “Dünya” qəzeti, №39-40, 2012-ci il.
**38. www.az.wikipedia.org** saytında “Məşədi Qasım”, “Yasif Kərimov”, “Abbas Qasımov”, “Nəbi Zeynalov”, “Ziyafət Balıyev”, “Mehdi Məhərrəmov”, “Rəsul İlyasov” məqalələri.

# MÜNDƏRİCAT

**Şəhid Yasif Kərimovun babası igid el qəhramanı Məşədi Qasım haqqında**

# ÖMRÜN ŞƏHİDLİK ZİRVƏSİ

**Bakı, "Elm və təhsil", 2012. - 160 səh.**

**"Elm və təhsil"** nəşriyyatının direktoru:
*professor* **Nadir MƏMMƏDLİ**

Kompyuter və dizayn:
**Araz Yaquboğlu,**
**Zaur Osmanov**
Korrektor:
**Mütəllim Həsənov**
Operator:
**Cəlal Arifoğlu**

Yığılmağa verilmişdir: 03.03.2012
Çapa imzalanmışdır: 15.09.2012
Şərti çap vərəqi: 10 ç.v., Sifariş №113
Kağız formatı: 60x84, 1/16. Tiraj: 500

Kitab **"Elm və təhsil"** nəşriyyat-poliqrafiya müəssisəsində hazır diapozitivlərdən çap olunmuşdur.
**E-mail:** elm_ve_tehsil@box.az
**Tel:** (+99412) 497-16-32, (+99450) 311-41-89
**Ünvan:** Bakı, İçərişəhər, 3-cü Maqomayev döngəsi 8/4